AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
MƏHƏMMƏD FÜZULİ adına ƏLYAZMALAR İNSTİTUTU

## SADİQ BƏY ƏFŞAR

# ŞEİRLƏR

### (TRANSFONELİTERASİYA VƏ FOTOFAKSİMİLE)

**BAKI – NURLAN – 2010**

Azərbaycan Milli Elmlər Akademiyası Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu elmi şurasının 2 dekabr 2009-cu il tarixli 11 №-li iclasının qərarı ilə nəşr edilir.

Nəşrə hazırlayan: **PAŞA KƏRIMOV,**
*filologiya elmləri namizədi*

Redaktoru: **ARIF RAMAZANOV**

Kompyuter icraçısı: **NƏZAKƏT ARIF QIZI**

**Sadiq bəy Əfşar. Şeirləri (Transfoneliterasiya və fotofaksimile). Bakı: Nurlan, 2010, 71+15 s.**

# SADİQ BƏY ƏFŞAR VƏ ONUN TÜRKDİLLİ LİRİKASI

XVI əsrin ikinci yarısı – XVII əsrin əvvəllərində yaşayıb yaratmış Sadiq bəy Əfşar dövrünün hərtərəfli istedada malik zəngin bilikli ziyalısı, görkəmli alim, şair və rəssam kimi mədəniyyət tariximizə düşmüşdür. Müxtəlif mənbələrdə adı Sadiq bəy Sadiqi və Sadiqi Kitabdar kimi də qeyd edilən şair əslən I Şah İsmayıl hakimiyyətə gəldiyi zaman Şamdan öz arzusu ilə ona qoşulmağa gələn Xudabəndəlü adlı türk-oğuz elinə mənsubdur. Tədqiqatçılar göstərirlər ki, Xudabəndəlü, Bəydili və İnallu obaları birlikdə Şamlu boyunu təşkil etmişlər (9,s.21). Sadiq bəy külliyyatının əvvəllərində özünün mənşəyi haqqında yazır: «Mən həqir Xudabəndəlü adı ilə məşhurlaşmış və tanınmış türk tayfasındanam. Onlar ədalətli şahın ölkə tutmağa və dünyanı almağa başladığı ilk günlərdə tabelik bildirmək və yardım etmək üçün Şam diyarından aləmin sığındığı dərgaha üz qoymuşlar» (9,s.20). Türkcə qitəsində şairin özünü «şamlu fəqiri» (3,s.917) adlandırması bir daha Xudabəntəlü elinin Şamlu boyunun tərkibinə daxil olduğunu sübut edir.

Müxtəlif mənbələrə istinad edən tədqiqatçılar 77 il ömür sürmüş şairin h.940-cı (m.1533) ildə Təbrizin Vercü (Vərci) məhəlləsində anadan olub, h.1017-ci (m.1609-1610) ildə İsfahanda vəfat etdiyini təsdiq edirlər.

20 yaşında atasını itirən şair dərvişlərə qoşularaq dünyanın müxtəlif yerlərinə səyahət etmiş, Təbriz,

Qəzvin və İsfahandan başqa Yəzd, Gilan, Lahican, Əbərkuh, Astarabad, Həmədan, Bağdad, Ətəbat (Nəcəf və Kərbəla) və Hələbdə olmuş, macəralı bir gənclik həyatı yaşamışdır. Qızılbaş sərkərdələrindən olan Əmir xan Mosullu Sadiq bəyi öz yanına dəvət edərək onun sərgərdan həyatına son qoymuşdur. Bundan sonra S.Əfşar öz biliyini artırmış, müxtəlif sahələrdə ciddi çalışmağa başlamışdır. Əmir xan Mosulludan sonra Sadiqi bir müddət İsgəndər xan və Bədir xan Əfşarın yanında xidmətdə olur. Gənc yaşlarından gərgin əməyi, zəhməti, istedadı sayəsində elmin, sənətin bir sıra növlərini mükəmməl öyrənən Sadiqinin şöhrəti qısa müddətdə bütün ölkəyə yayılır. Sadiq bəyin müasiri olan Qazi Əhməd Qumi xəttatlar və rəssamlar haqqında risaləsində onun istedadı barədə yazır: «Rəssamlıq sənətində onun tayı-bərabəri yoxdur, indi ona şahın kitabdarı vəzifəsi tapşırılmışdır. Yaxşı şeirlər yazır, onun çoxlu qəsidə, qitə, qəzəl və rübaisi vardır. Təsviri sənətdə öz fırçasının ecazkar gücü ilə insanı heyran edir. Cəsurluqda dövrünün igidlərindən heç də geri qalmır» (6,s.16). Məhəmməd Tahir Nəsrabadi təzkirəsində Sadiq bəyin cəsur və mərd bir insan olduğunu göstərir, rəsm əsərlərinin şöhrətinin Hindistana gedib çatdığını bildirir» (12,s.56).

Sadiqinin tərcümeyi-halındakı ən əlamətdar hadisələrdən biri müxtəlif sahələrdə, o cümlədən, rəssamlıq və xəttatlıqda istedadı nəzərə alınaraq onun saray kitabxanasına rəhbər təyin edilməsidir. Görkəmli ədəbiyyatşünas alim Məhəmmədəli Tərbiyət Sadiq bəyin II Şah İsmayıl zamanında (1576-1577) kitabxanaya işə götürüldüyünü, I Şah Abbas dövründə (1587-1629) isə kitabxanaya başçılıq etdiyini göstərmişdir (13, s.280). Şairin imzasının bəzi mənbələrdə Sadiqi-Kitabdar kimi verilməsi də elə onun bu işi ilə bağlıdır. Sənətşünaslıq

doktoru Adil Qazıyev Sadiqinin artıq Məhəmməd Xudabəndənin hakimiyyəti dövründə (1578-1587) həmin kitabxanaya başçılıq etdiyini təsdiq edir (1,s.3). Mənbələrin göstərdiyinə görə, Sadiq bəy cəmiyyətdə və sarayda elə böyük nüfuz sahibi olmuşdur ki, bəzi səbəblərə görə saray kitabdarlığından uzaqlaşdırıldıqdan sonra da ömrünün sonuna qədər bu vəzifənin təqaüdünü almışdır.

Özündən sonra zəngin bir irs qoyan S.Əfşarın əsərləri külliyyatında toplanmışdır. Şairin külliyatının əlyazmasının Təbriz Dövlət Kitabxanasında saxlanan nüsxəsinə daxil olan əsərlər sonradan yazılaraq əlavə edilmiş mündəricatda aşağıdakı şəkildə təqdim edilir: 1) Qəsidələr («Zübdətül-kəlam»); 2) Qəzəllər; 3) Müxtləif şeirlər; 4) Şairlər təzkirəsi («Məcməül-xəvas»); 5) Rübailər; 6) Məqalə və mənzum hekayətlər; 7) Şairlər adına deyilmiş müəmmalar; 8) «Fəthnamə» məsnəvisi; 9) Şairlər təzkirəsinin ardı; 10) Türk dilində yazılmış qəsidə və qəzəllər; 11) Feyzi şeirləri haqqında risalə; 12) «Qanunüs-süvər» - rəssamlıq haqqında risalə; 13) «Həzziyyat» risaləsi; 14) mərsiyə və tərkibbənd; 15) Tərkibbənd-əlifba sırası ilə; 16) Tərcibənd; 17) Heydərinin həcvi; 18) Münşəat-türk və fars dillərində; 19) Fələkdən şikayət və Məhəmməd bəy Məzaqinin həcvi; 20) Müxtəlif həcvlər (2, s.8-9).

Sadiqinin ən çox diqqəti cəlb edən əsərlərindən olan «Məcməül-xəvas» təzkirəsi ədəbiyyat, elm və ədəbi fikir tariximizin öyrənilməsində mühüm rol oynamışdır. Təzkirə təxminən h.1007-1008-ci (m.1597-1598) illərdə yazılmışdır. Əsər Osmanlı torpaqlarından tutmuş bugünkü İran, Azərbaycan, Orta Asiya, Əfqanıstan, Pakistan və Hindistana qədər böyük bir ərazinin konkret bir zaman çərçivəsində (I Şah İsmayıl dövründən müəllifin həyatda olduğu günlərədək) ədəbi və ictimai-

siyasi mühitini əks etdirir. Şairin özünün qeyd etdiyi kimi, bu əsər müəllifin uzun müddətli səyahətlərinin, müşahidələrinin, topladığı zəngin məlumatların məhsuludur. O, səyahət etdiyi ölkələrdə dövrünün məşhur şair və digər sənət adamları ilə görüşmüş, onlarla söhbətlər etmiş, təzkirəsini də bu məlumatlar əsasında yazmışdır. Sadiq bəy «Məcməül-xəvas»ın müqəddiməsində özünə nümunə götürdüyü Əbdürrəhman Caminin «Baharistan», Əlişir Nəvainin «Məcalisün-nəfais», Dövlətşah Səmərqəndinin «Təzkirətüş-şüəra» və Sam Mirzənin «Töhfeyi-Sami» təzkirələrinin adlarını çəkmiş (2,s.13), bu silsilədən olan öz təzkirəsini yaratmışdır. Bu əsərilə Sadiqi dövrünün «xoştəb», «şirinkəlam» şairlərini tanıtmış, onların irsinin öyrənilməsinə maraq oyatmışdır. Sadiq bəy adları sadalanan təzkirələrdən ən çox Nəvainin «Məcalisün-nəfais»inə maraq göstərmiş, ona müvafiq olaraq əsərini səkkiz bölməyə ayırmışdır. Təzkirənin ən önəmli cəhətlərindən biri ondan ibarətdir ki, Azərbaycan, Osmanlı, cığatay türkcəsini gözəl bilən müəllif bu üç türk xalqının ədəbiyyatını, görkəmli şair və ədiblərini bir topluda birləşdirərək oxuculara, tədqiqatçılara təqdim etmiş, onlar haqqında əvəzsiz məlumatlar vermişdir. Görkəmli ədəbiyyatşünas alim Turxan Gəncəyinin dediyi kimi, «Sadiqi bu əsərdə siyasi hüdudları və sülalələr arasındakı ixtilafları bir tərəfə ataraq türk dli və ədəbiyyatını bir bütün halında götürmüş və türk dilinin üç ədəbi şivəsinin şairlərini tanıdaraq əsərlərindən örnəklər vermişdir. Bu təzkirə onun Nəvainin əsərlərini yaxından bildiyini və dövrünün türk şairlərini şivə fərqi gözləmədən tədqiq etdiyini və bu üç şivəni də mükəmməl bildiyini göstərir» (5,s.20).

Məhəmmədəli Tərbiyət göstərir ki, təzkirə Səfəvilər dövründə yaşamış 480 şair və ədibi əhatə edir (13, s.281).

Müqəddimə, 8 məcmə və xatimədən ibarət bu təzkirənin tədqiqatçıları göstərirlər ki, əsər Nəvainin üslubuna və təzkirəçilik ənənəsinə uyğun bir şəkildə yaradılsa da, öz orijinallığı və elmi-bədii dəyəri ilə bu janrda yazılmış orta əsr təzkirələri içərisində xüsusi bir mövqeyə malikdir. Təzkirəni oxuduqca görürük ki, Sadiq bəy üçün təqdim etdiyi şairin şəxsi insani keyfiyyətləri çox böyük önəm daşıyır.

Sadiqini diqqətimizi cəlb edən elmi əsərlərindən biri də rəssamlığın praktiki, nəzəri məsələlərinə həsr olunmuş «Qanunüs-süvər» («Təsvirlər qanunu») adlı 204 beytdən ibarət mənzum risaləsidir. Tədqiqatçıların nadir əsər kimi dəyərləndirdikləri bu risalədə müəllif rəssamlara özünə qarşı tələbkar olmağı, rəssamlıq materiallarını, təsvir etdiyi obyekti mükəmməl bilməyi məsləhət görür. Sadiqi sənətkarda istedadı, fərdiliyi, rəsm əsərlərində bitkinliyi yüksək dəyərləndirdiyini bildirir, o dövrün rəssamlarına işlətdikləri bədii-texniki material barədə texnoloji təlimat verir. 17 qısa bölmədən ibarət olan bu əsərdə təsviri sənətin müxtəlif məsələlərinə dair konkret məsləhət və təlimatlar verilmişdir. Risaləni orta əsrlər rəssamlarının yaradıcılıq metodunu öyrənmək baxımından yüksək qiymətləndirən A.Qazıyev yazır: «Əlbəttə, bu əsər müasir mənada tam metololoji vəsait olmayıb, orta əsr incəsənətinin yaradıcılıq üsulları və əsas ləvazimatı haqqında müəllifin öz zəngin təcrübəsi əsasında tərtib etdiyi faydalı nəsihətlər, göstərişlər məcmuəsidir. Risalənin verdiyi məlumatdan bir daha aydın olur ki, orta əsr rəssam və nəqqaşları öz yaradıcılıq metodlarında o dövrə xas olan metafizik dünyagörüşündən doğan dəyişilməz bədii

üsullara və «qanunlara», sabit ehkamlara əsaslanmışlar. Bununla belə, onlar təbiətin rəngarəngliyini, onun təkrarolunmaz müxtəlif fakt və hadisələrini mümkün qədər (şərti üsullarla da olsa) doğru əks etdirməyə maraq göstərmişlər» (1, s.4-5).

Sadiqiyə görə, rəssam təbiətə qarşı həssas, diqqətli olmalı, ondan öyrənməlidir: «Əgər muradın surətgərlik olarsa, ustadın təbiət olmalıdır» (1,s.19).

Sadiq bəyin zəngin ədəbi irsində nəsihətnamələri və mənzum hekayələri, məktubları və «Risaleyi-həzziyat» adlı insanların mənəvi aləminə, məhəbbət, dostluq münasibətlərinə, gənclərdə bədii zövqün inkişaf etdirilməsinə həsr edilmiş əsəri diqqəti cəlb edir.

S.Əfşarın poetik yaradıcılığı zəngin, rəngarəngdir. O, fars və türk dillərində qəzəl, qəsidə, qitə, rübai, müxəmməs, tərcibənd, tərkibbənd, məsnəvi, müəmma janrlarında gözəl şeirlər müəllifidir. Tədqiqatçı M.Muradovanın hesablamalarına görə onun 587 qəzəlindən 40-i türkcədir (9,s.67). Şairin farsdilli poetik yaradıcılığında Şah Abbasın hakimiyyətinin ilk illərindən və onun apardığı müharibələrdən bəhs edən «Fəthnameyi-Abbas-namdar» adlı 2500 beytdən ibarət poeması mühüm yer tutur. Müəllif müxtəlif tarixi hadisələri, döyüşləri yüksək bədii formada, təşbih və istiarələrin köməyi ilə təsvir edir, Şah Abbasın müxtəlif müharibələrdən, ən çətin vəziyyətlərdən qalib çıxan qəhrəman obrazını yaradır. Əsəri oxuduqca bu qəhrəmanlıq dastanının yazarının yersiz müharibələrə, qan tökülməsinə qarşı çıxdığını görürük.

Sadiq bəy Əfşarın türkcə yazdığı əsərləri içində «Məcməül-xəvas» təzkirəsini, külliyyatına daxil edilmiş şeirlərini və məktublarını (18 məktublarından 14-ü ana dilindədir) göstərə bilərik. Şairin türkcə şeirləri onun Təbriz Dövlət Kitabxanasında saxlanan əlyazma

külliyatının 888-917-ci səhifələrini əhatə edir. Bundan başqa, Sadiqinin təzkirəsinə daxil etdiyi, məktublarında rast gəldiyimiz bəzi türkcə şeirlərinin də olduğunu qeyd etməliyik.

Müxtəlif tədqiqat əsərlərində Sadiq bəyin türkcə şeirlərindən müəyyən nümunələr verilsə də, bu əsərlər bütöv halda çap edilməmiş, buna görə də şairin anadilli lirikasının ətraflı araşdırılması mümkün olmamışdır. Sadiqinin türkcə şeirlərinin surətini Təbriz Dövlət Kitabxanasından əldə edərək çap etdirməyimizin əsas səbəbi də bu boşluğu doldurmaqdan ibarət olmuşdur.

Hələ sağlığında dövrünün görkəmli şairi və alimi kimi tanınan S.Əfşar klassik Şərq ədəbiyyatını, poetikasını gözəl bilmiş, sələflərinin yaradıcılığının ən dəyərli cəhətlərindən təsirlənmişdir. Sadiq bəy böyük Azərbaycan sənətkarlarından ən çox Xaqani Şirvani, Nizami Gəncəvi və Füzulinin, fars şairlərindən Firdovsi, Ənvəri, Kəmaləddin İsfahani, Zəhir Faryabi, Sədi və Hafizin əsərlərindən bəhrələnibdir. Ana dilində yazdığı şeirlərdən şair türkdilli ədəbiyyatın iki dahisini – Nəvai və Füzulini özünə üstad seçmişdir. Ümumiyyətlə, XVI əsrin ikinci yarısında- XVII əsrdə türkdilli şeirimizin, demək olar ki, bütün nümayəndələri yaradıcılıqları boyu ən dəyərli örnək kimi bu iki sənətkarın poeziyasına üz tutmuşlar.

T.Gəncəyinin dediyi kimi, Sadiq bəy türk dilinin üç ədəbi dilini (Azərbaycan, Osmanlı və Cığatay) mükəmməl bilmiş və türkcə şeirlərini də bu şivələrdə yazmışdır. Şairin 1971-ci ildə şairin 12 qəzəlini oxuculara təqdim edən alim bunlardan 8-nin Şərqi türkcədə, cığataycada yazıldığını xüsusilə qeyd edir (5,s.21). Sadiqinin türkcə şeirlərindən danışarkən onların müxtəlif türk şivələrində yazıldığını əlbəttə ki, nəzərə almaq lazımdır.

S.Əfşarın 478 beytdən ibarət türkcə şeirlər toplusuna 5 qəsidə, 40 qəzəl, 1 saqinamə, Şah Abbasa müraciətən məsnəvi formasında yazılmış 1 şeir, 1 tərkibbənd və 1 qitə daxil edilibdir. Bu şeirlər əlifba sırası ilə düzülməmişdir.

Buradakı qəsidərdən birincisində şair obrazlı şəkildə, alleqoriyadan istifadə etməklə havaların soyumasını, qışın gəlməsi ilə təbiətdə baş verən dəyişiklikləri təsvir edir. Məlum olduğu kimi, klassik ədəbiyyatda işlənən bədii vasitələrdən biri də təşxis sənətidir. Təbiət hadisələrini şəxsi xüsusiyyətlərlə təsvir etmək, onları canlı insan kimi təsəvvür etmək həmin vasitə ilə gerçəkləşir ki, bu da Avropa poetik sistemindəki personifikasiya kateqoriyasına uyğun gəlir (7,s.32). Sadiqi bu qəsidəsində təbiəti təsvir edərkən daha çox təşxis sənətinə müraciət etmişdir. Ümumiyyətlə, təbiət vurğunu olan şair ilin bütün fəsillərini böyük məhəbbətlə qələmə almış, canlı bədii lövhələr yaratmışdır. Qəsidədə ilin elə bir vaxtı təsvir edilir ki, havaların tarazlığı pozulmuş, al-əlvan təbiətdən cəmi bir neçə rəng qalmışdır. Gülün çöhrəsini görə bilməyən bülbül artıq susmaqdadır, çəmən məclisində nə bir yarpaq, nə quşların nəvası qalmışdır. Şair çayın suyunun donmasını soyuğun möcüzəsi ilə əjdəhanın donmasına bənzədir:

Yeritməz oldu çəmən içrə cuybar suyun,
Daş oldu möcüzi-sərma ilə bu əjdaha (3,s.888).

Soyuq elə işlər görmüşdür ki, indi artıq bənövşə ilə reyhan arasında fərq yoxdur:

Dəmi-təsərrüfi sərma ilə yox onlarda
Bu gün bənəfşəvü reyan təfavüti əsla (3,s.889).

Şaxtadan qulaqların göyərməsini şair müəllim – qışın soyuq silləsi ilə insanların peysərinə vurması kimi mənalandırır:

Kəbud etdi binaquşi müəllimi-dey,

Ona tapançeyi-bərd ilə bəs ki, urdu qəfa (3,s.889).

Gül üzünü qibləgahından – gülşəndən çevirmişdir ki, bu da müsəlmanın ona verilən əziyyətlərdən sonra dinini dəyişməsinə bənzədilir:

Çavurdu gül yüzünü qibləgahi-gülşəndən,
Cəfadən olsa müsəlman əcəbmidir tərsa (3,s.888).

Qışın soyuğu hər şeyi dəyişdirmişdir. Nə əvvəlki gülşən, nə də çəmənlik var. Təbiət yeni heç nə yaratmır. Şair təbiətin qış vaxtındakı qısırlığını poetik surətdə şərh edərkən qədim Şərq inanışlarına işarə edərək təlmih bədii ifadə vasitəsindən məharətlə istifadə edir:

Kəsildi rəsmi-təvəllüdləri kim, etməzlər,
Müvasibət həvəsin ümmətat ilən aba (3,s.888).

Təsəvvürlərə görə, təbiətin məvalidi-səlasəsi (üç övladı) – cəmadat (cansız əşyalar), nəbatat (bitkilər) və heyvanat abayi-ülvi-səmadakı atalar (səma cismləri) ilə ümməhaiti-selfinin – yerdəki anaların (dörd ünsür: su, od, torpaq, yel) müvasilətindən, birləşməsindən yaranır. Qışda səmadakı atalarla yerdəki anaların birləşməyə həvəsləri olmadığından təbiətdə yeni bir şey yaranmır.

43 beytlik bu şeiri ədəbiyyatımızda qışın təsvirinə həsr olunmuş ən uğurlu şitaiyyə qəsidələrindən hesab etmək olar. Əsər Sadiqinin həyatı diqqətlə müşahidə etmək, yüksək bədiiliklə oxucuya çatdırmaq istedadına malik olduğunu sübut edir.

İkinci qəsidə Həsrəti-Əlinini mədhinə həsr edilibdir.

Üçüncü qəsidə şairin qürbətdə olduğu zaman yazdığı şərhi-haldır. Məlum olduğu kimi, Sadiq bəy uzun müddət səyahətlər etmiş, vətənindən kənarda yaşamışdır. O, bu şeirdə qürbətdə olmasının səbəbini izah edir. «Əgər qürbətdə, zarəm, izzətim yox, ariyəm qəmdən» (3,s.891)-deyən şeir vətənimdən kənarda tanınmasa da, izzəti, hörməti olmasa da, qəmdən azad olduğunu söyləyir. S.Əfşar istedadının yetərincə

dəyərləndirilməməsindən, cəmiyyətdə əsl qiymətini almamasından narazıdır. O, vətənindən kənarda yaşamasını cəmiyyətdən narazılığının ifadəsi, bir etiraz aksiyası kimi təqdim edir. Sadiqiyə görə, əgər bu zəmanədə istedadını dəyərləndirəcək bir adam olsaydı, dövran onu dünyaya gətirməzdi. O, bu dünyaya qiymətini almamaq üçün gəlmişdir:

Bu istedad ilə dövran bəni eylərmidi mövcud,
Əgər bilsəydi bu canbin cəhanda var xiridarı.

Bəni xar etmək üçün qürbü vəsli qeyrə tapşırdı,
Çəmən içrə, bəli, bihudə dehqan bəkləməz xarı.

Məni-üftadəni, ey dəhri-dun, hər dəm basıb keçmə,
Qəribin gərçi derlər pəst olur hər yerdə divarı.

Səzavari-məhəbbətdir ədu bəzmi-fəraqətdə,
Mənimi gördün, ey çərxi-fələk, möhnət səzavarı? (3,s.891).

Şair çərxi-fələyə üz tutaraq deyir ki, bəzmi-fəraqətdə-ayrılıq məclisində düşmən də məhəbbətə layiqdir. Sən möhnətə mənimi layiq gördün, Yəni, fələyin ona düşmən olduğunu Sadiqi yaxşı bilir.

Sadiq bəy Əfşar bir sıra əsərlərində, o cümlədən, «Məcməül-xəvas» təzkirəsində dövrünün hökmdarlarına, nüfuzlu şəxslərinə mədhiyyə yazmağa qarşı çıxdığını bildirmişdir. O, təzkirəsində heç bir hökmdara mədh yazmamış Mövlana Zəmirini buna görə yüksək dəyərləndirdiyini bildirərək yazır: «Yüz min beyt şeiri var. Hökmdarların mədhinə bir beyt də yazmayıb. Himmətin ucalığına bu özü bir sübutdur» (2, s.165).

Bu dediklərinə baxmayaraq, Sadiqi də klassik Şərq poeziyasının ənənəlirini davam etdirərək yaşadığı

dövrün hökmdarı I Şah Abbasa bir sıra mədhiyyələr yazmışdır. Şair küliyyatındakı türkcə qəsidələrindən dördüncüsünü mürşidi-kamil, dinin dayağı adlandırdığı Şah Abbasın mədhinə həsr edibdir. Şeirdə şahın ədaləti, mərhəməti, din düşmənlərinə qarşı mübarizə aparması xüsusilə nəzərə çarpdırılmışdır. Onun ədaləti o qədər böyükdür ki, sitəmkar çərxi belə özünə tabe edə bilər, din düşmənlərinə qarşı elə mübarizə aparmışdır ki, ölkədə küfrün əsər-əlaməti qalmamışdır:

Yetişdi ol yerə ədlin ki, rəsmi-istiqamətdə,
Özinə tabe eylər istəsə çərxi-sitəmkarı.

Cəhanda küfr zülmün sən yox etdin, varmış derlər,
Sənin dövründə möhkəm küfri-islamın yox dəvvarı (3,s.892).

Beşinci qəsidəsində şair təbiətin gözəlliklərindən danışaraq, bütün bunlara görə Yaradana dua edir.

Sadiqinin türkcə şeirlər toplusuna daxil edilmiş qəzəllər onun lirik yaradıcılığının tədqiqi baxımından böyük önəm daşıyır. Məhəbbət mövzusu, dostluğun tərənnümü, insan taleyi ilə bağlı düşüncələr, təbiət mənzərələrinin təsviri bu şeirlərdə ilk diqqəti cəlb edən cəhətləndəndir. Lirik şeirlərində məhəbbəti insanın ən ülvi duyğusu, onun mənəvi yüksəlişinin səbəbi olan qüvvə kimi tərənnüm edən şair eşqi yolunda hər cür cəfalara hazır olan aşıq obrazı yaradır. Özünü «mehrü vəfa təkyəsinin babası» (3,s.905)-adlandıran Sadiq bəy çəkdiyi əziyyətlərdən bezib yolundan dönmək fikrində deyil, çünki əvvəldən könlünü qəmzəsi ilə qanını içən məşuqəyə verdiyini bilirdi:

Sadiqi, gər yürəgü qanın içər, ah etmə,
Könlüni vermiş idün qəmzeyi-xunxarəsinə (3,s.902).

Eşq insanın canına düşmüş od, ildırımdır, aşiqin zəif canını bəla tələsinə salan qüvvədir:

Yenə nə bərq idi kim, yıxdı səbr bünyadın,
Gətirdi rəxneyi-qəm mülki-xanımanımğa.

Yenə nə şövq idi kim, kəsdi riştəyi-canım,
Buraxdı dami-bəla cismi-natəvanımğa (3,s.897).

Vüsal dəmlərində isə aşiqin həyatı büsbütün dəyişir, onun payız çağını yaşayan bostanına bahar gəlir:

Yenə nə gülbüni-vəsl idi kim, şüküftə bolub,
Bahara verdi xəzan bərli bustanımğa (3,s.897).

Sadiqinin lirik qəhrəmanı eşqi yolundakı fədakarlığı ilə fəxr edir, özünü klassik Şərq ədəbiyyatının aşiq obrazları ilə müqayisə edir. Şairə görə Məcnunla Fərhad eşqin tüstüsünü götürüb, dövrlərini sürüb getmişlər. İndi onun növbəsidir və eşqin oduna dözmək də onun bəxtinə düşmüşdür:

Gərçi eşqin tüstüsün Fərhadü Məcnun çaldılar,
Şimdi eşq olub olardin bizgə verdi növbəti (3,s.900).

Fədakar aşiq çox ah çəkməkdən ona görə qorxur ki, onun ahının odu digər aşiqləri də yandıra bilər:

Rəhm qıl həmdərdlərə, ey Sadiqi, çox çəkmə ah,
Köyməsün Məcnunüvü yandırmasun Fərhadı ot (3,s.904).

Çəkdiyi cəfa dolu həyat aşiqin keçirdiyi normal haldır, o bu əzablı vəziyyətində dözümlüdür, hətta məhəbbət əzablarını öz dərdlərinin ən böyük məlhəmi hesab edir. Cisminin büsbütün hicran oduna yanmasında da aşiq bir fayda görür: belə olarsa, o vüsal cənnətinə saf və pak gedə bilər:

Yakarsa hicr odu aludə cismimi, nə ziyan
Ki, vəsl uçmağına safü pak olub gedərin (3,s.908).

Yarından ayrı olduğu məqamlarda şair onun xəyalı ilə yaşayır. Sadiqi bu fikri poetik şəkildə ifadə etmək üçün maraqlı obraz yaratmışdır: İsa göylərə çəkilib günəşin

qoynuna girdiyi kimi, ay üzlü sevgilisi onun könülünün qoynuna girir:

Könlümün hər dəm girər ol mahsuma qoynuna,
Yeridür gər girsə xurşidin Məsiha qoynuna (3,s.906).

Mücərrəd və konkret anlayışlar məharətlə bir araya gətirilmişdir. İnsanın qəlbi, könlü konkret bir anlayışdır. Təxəyyülü zəngin olan şair ona insana məxsus bədən üzvü «bəxş» etməklə istiarə poetik fiqurundan istifadə etmişdir. Sevgilisindən ayrı onun xəyalı ilə yaşayan aşiqin könlünün qoynuna yarının girməsi şairin diqqətəlayiq poetik tapıntılarındandır. Qəzəlin digər beytləri də maraqlı obrazlarla yadda qalır:

Sinəmi hal eyləyüb ol ay xəyalın bəklərin,
Öylə kim, bəkləşdirür xaçını tərsa qoynuna…

Cövhəri-əşkim cəhanı tutdu, övladur bu kim,
Qoymaya şimdən geri lölöni dərya qoynuna.

Qeyr əgər əhval ilə bəzmi-vüsala yol tapar,
Sadiqi alır xəyali-yarı tənha qoynuna (3,s.906).

Sevgilisinin xəyalı aşiq üçün xaçpərəstin sinəsindəki xaç qədər əzizdir. Onun gözlərindən göz yaşları – gövhərlər axıb bütün dünyanı tutmuşdur, neçə ki, dəniz incini yetişdirib, özündən kənar edə və bir də geri qayıtmağa qoymaya. Məqtə beytində şair birinci beytdəki fikrini oxucusuna daha aydın çatdırır: Könlünün qoynuna aldığı yarın özü deyil, xəyalıdır. Başqaları gerçək vüsala yetdikləri halda şair sevgilisinin xəyalı ilə kifayətlənməli olur.

Eşqdən saralmış çöhrəsinə bahar yağışı-göz yaşları yağan şair bu vəziyyətdə bir ziddiyət, qəribəlik görür, buna görə də eşq aləmini «qərib aləm» adlandırır:

Qərib aləm imiş eşq, Sadiqi kim irür,

Xəzani çöhrə bilə əbri-novbahar gözüm (23, s.907).

«Vida» rədifli qəzəlində şair yarından ayrılan aşiqin kədərini səmimi bir dillə ifadə etmişdir. Gözəlin ona vida etməsi xəstə bədənindən ruhunun ayrılaraq vidalaşmasına bənzədilmişdir. Sevgilisi hara getsə, aşiqin həsrət göz yaşları onun ardınca axacaqdır, göz yaşları yarının ayağının altındakı torpağı heç bir zaman tərk etməyəcəkdir:

Qıldı həngami-səfər sərvi-xuramanım vida,
Vəqtidür qılsa təni-dilxəstəni canım vida…

Barsa hər yanğə barur ardınca əşki-həsrətim,
Eyləməz ol xaki-padən çeşmi-giryanım vida (3,s.908).

«Gedərin» rədifli qəzəli də Sadiqinin hicran qəminin ağrı-acılarına həsr etdiyi səmimi və təsirli şeirlərindən biridir:

Qəmi-fəraqın ilə dərdnak olub gedərin,
Nə dərdnak ki, qəmdin həlak olub gedərin.

Nə dövri-xasdır, ey Sadiqi, bu kim, məni-məst,
Gəlüb təmani-hünər, eybnak olub gedərin (3,s.908).

Bu şeirdə şair yaşadığı dövrdən narazılığını da açıq-aşkar bildirmişdir: bu necə zamandır ki, dünyaya istedadlı, hünərli gələn adam ömrünün sonunda bu dünyadan günahkar, eybli vəziyyətdə tərk etməlidir?

Ümumiyyətlə, Sadiqinin şeirlərində aşiqanə lirika və ictimai motivlər bir-biri ilə üzvi surətdə bağlanmışdır. Zəmanəsinin kədərindən, qayğılarından qocaldığını bildirən şair «Məni-üftadəni ənduhi-dövran gərçi pir etdi» (3,s.907) deyir.

Fələk tərəfindən biqərar, səbatsız vəziyyətə düşməsini də şair dövranın biqərarlığı ilə izah edir:

Biqərar etdi fələk dönə-dönə Sadiqini,
Şimdi bildim ki, qərarı yox imiş dövranın (3,s.898).

«Yegdür» rədifli qəzəlində şair dövrünü daha sərt ifadələrlə tənqid edir, «Əgər dünya budursa, elə bizim evsiz-eşiksiz olmağımız yaxşıdır»- deyir:

Əgər dünya budur, bixanü biman olmamız yegdür,
Buraqıb işrət əsbabını üryan olmamız yegdür.

Bu isə şeyxü vaiz, məscidü minbər tamaşası,
Xərabat əhlidin məstü gəzəlxan olmamız yegdür…

Bulunmaz çün cəhan məmurəsində xaneyi-munis,
Ənisi-qəm, müqimi-gənci-viran olmamız yegdür (3,s.909).

Əgər şeyx və vaizlər bunlardırlarsa, dini atıb eyş-işrət əhli olmaq daha yaxşıdır. Bu dünyada insana munis olan bir yer yoxdursa, qəmlə dost olub viranələr xəzinəsinə sakinlik etmək yaxşıdır. Bütövlükdə şeir dövrün sərt ittihamı kimi səslənir, ədalətpərəst, azadlıqsevər şairin dövrünə münasibətini açıq ifadə edir.

Xüsusilə ictimai fikirlərində Sadiqinin Nəvai və Füzuli yaradıcılığı ilə nə qədər sıx bağlı olduğunu görə bilərik. Şair bu dahi ustadların ədəbi irsində onu narahat edən məsələlərin bədii həllini görürdü, bundan ilhamlanırdı. Sadiq bəyin şeirlərində Nəvai poeziyasının təsirindən danışan C.Nağıyeva yazır: «Onun «Bulğay kaş ki», «Etdin», «Qalmadı», «Sübh» və başqa qəzəlləri də yalnız rədif baxımından deyil, ideya, məzmun və bədii ifadə vasitələrindən istifadə baxımından Nəvai ilə birləşir» (10, s.162).

Nəvainin «Bolmasun» rədifli 7 beytlik qəzəlinə yazdığı nəzirəsini oxuduqca Sadiq bəyin ustad şairin əsərinə çox diqqətlə yanaşdığını, eyni zamanda, sadəcə nəzirə deyil, orijinal bir şeir yazdığını görürük. Nəvainin lirik qəhrəmanının qəlbi sevgilisinə ən səmimi duyğularla doludur. İstədiyi odur ki, könül verdiyi gözələ heç bir

xətər yetməsin, bu dünya bağında onsuz bahar olmasın. Şair arzu edir ki, sevgilisinin sərvi-qəddi ancaq çeşmeyi-heyvandan, əbədiyyət çeşməsindən qidalansın:

Ğam əlidin, ya Rəb, ul qulğa ğubari bolmasun,
Balki onsiz dahr boğida bahori bolmasun.

Qəddinin sarviğa kim, boği-latovat nəxlidur,
Çaçmai-hayvondin uzqa cuybari bolmasun (11, s.495).

Bu qəzələ Sadiqinin cığatayca eyni rədifli, eyni bəhrdə yazdığı 6 beytlik cavabda gözələ hədsiz məhəbbət, sədaqət duyğuları daha çox lirik qəhrəmanla bağlı şəkildə ifadə edilmişdir:

Gözə ol şəh yolidin özge ğubari bolmasun,
Məndin özge kimseğe andin güzari bolmasun.

Gülşəni-kuyində kim, sərvi-qədi məvasidür,
Hər tərəf əşkimdən özgə cuybari bolmasun (3,s.898).

Sadiqinin qəzəlində müəllifin fərdiyyəti daha çox nəzərə çarpır. Lirik qəhrəmanın istədiyi budur ki, ondan başqa heç kim sevgilisinin yolunun üstündə durmasın, fədakar aşiqin gözlərinə yalnız yarının ayağının tozu dolsun, sərvi-qəddini yalnız onun göz yaşları sulasın. Nəvai sevgilisinin sərvi-qəddinin çeşmeyi-heyvan-dirilik suyu ilə sulanmasını arzulayırsa, Sadiq bəy məşuqəsinin sərvi-qəddinin onun öz göz yaşları ilə qidalanmasını istəyir.

Nəvai 8 beytlik «Kaş ki» rədifli qəzəlində ayrılıq dərdini çəkməkdənsə min cür möhnət çəkməyə üstünlük verdiyini, eşq dərdindən dəlilər kimi səhraya düşduyünü, buna görə də əvvəllər gözəllərlə ünsiyyət bağladığından peşman olduğunu bildirir. Bir beytdə qəriblərin qürbətdə acı çəkdiyini, qürbət sözünü dilə gətirmək belə

istəmədiyini söyləyən şair, qəzəlin sonunda arzusuna, vüsala çatmaq üçün ömürdən möhlət dilədiyini yazır:

Bulğay erdi yüz tüman, min rancu mehnat kaş ki,
Bulmağay erdi balou dardi-furkat kaş ki…

Xosiyat çün telbarab sahroğa yuzlanmak emiş,
Tutmağay erdin parilar birla ulfat kaş ki…

Yuz ğarib ahvol bekaslıkda har dam bor emiş,
Utmaqay erti tilimda lafzi-ğurbat kaş ki…

Dema kim con et fido ahbob ila topqaç visal,
Ey Navoiy, umr berqay onça muhlat kaş ki (11, 607).

Sadiqi bu şeirə yazdığı 6 beytlik cavabında böyük özbək şairinin yaradıcılığına məhəbbət və diqqətini, cığataycanı gözəl bilməsini nümayiş etdirməklə bərabər, orijinal fikirlərlə çıxış etmiş, lirik şeirə ictimai motiv əlavə etmişdir. Nəvai qürbətin ağır dərd olduğundan danışırsa, Sadiq bəy «Əgər vətən övladları insanın qədrini bilmirlərsə, qürbət bundan yaxşıdır» deyir. Zəmanəsinin ədalətsizliklərindən, özünə qarşı olan haqsızlıqlardan şikayət edən belə misralar Sadiqi şeirlərində az deyil. Sadiq bəy kimi çoxtərəfli istedadın, dövrünün ensiklopedik zəkasının «belə vətəndənsə qürbət yaxşıdır» deməsi, əlbəttə ki, mövcud quruluşa, dövrə ciddi ittihamdır:

Bilməs ermişlər kişi qədrin vətən əbnası çün,
Tutqay erdi damənimni xaki-qürbət kaş ki(3, s.901).

Beytlərindən birində şair ona ağıl vermək istəyən nasehə «kaş ki, bu könül mənim nəsihətimi eşidəydi» cavabını verir. Yəni məgər aşiqin ixtiyarı özündədirmi ki, ona nəsihət verirsən:

Dersən, ey naseh ki, məndin tut nəsihət, aqil ol,
Tutqay erdi bu könül məndin nəsihət kaş ki (3,s .901).

Burada Füzulinin «Əql yar olsaydı, tərki-eşqi-yar etməzmidim? İxtiyar olsaydı, rahət ixtiar etməzmidim?» (41, s.220) beyti yada düşür. Sadiqinin cığatayca şeirlərində Nəvai ilə bərabər Füzuli yaradıcılığı ilə də səsləşməni müşahidə etmək bizi təəccübləndirməməlidir.

S.Əfşar bir çox şairlərimiz kimi Füzulinin möhtəşəm poeziyasını özü üçün ən gözəl örnək saymışdır. Şairin yaradıcılığında Füzuli sənətinin bədii təsir vasitələrinin və ifadə xüsusiyyətlərinin təsiri aydın görünür. Sadiqi şeirlərində dahi şairin poetik ustalığından, təşbih, istiarə, mübaliğə və təzadlar yaratmaq üsullarından geniş istifadə etmişdir. Füzulinin gözəlliyi, eşqi, tərənnüm edən, həyatdakı ədalətsizliklərə, insanlar arasındakı qeyri-bərabərliyə etirazını bildirən ictimai-fəlsəfi poeziyası Sadiqi yaradıcılığına güclü təsir etmişdir.

Füzulinin «Sübh» rədifli, eyni vəzndə iki qəzəli (4, s.88, 90) vardır ki, bunlar Nəvai qəzəlinə nəzirə olaraq yazılmışdır. Bu şeirində Füzuli sübhün gəlməsini mahir bir rəssam kimi təsvir etmiş, onu Nəvaidə olmayan bir tərzə mənalandırmışdır.

Sadiqi, fikrimizcə, Nəvainin də, Füzulinin də «Sübh» rədifli qəzəllərini oxumuş, nəzirə yazarkən Füzuli şeirini üstün tutmuşdur. Füzuliyə yazdığı cavabında o, dahi söz ustadı tərəfindən yaradılan hər səhər sübhün yaxasını yırtması obrazın eynilə təkrar edir. Füzuli deyir:

Gər deyil bir mah mehrilən mənimtək zar sübh,
Başın açıb nişə hər gün yaxasın yırtar sübh (4, s.88).

Mənim kimi bir ayın-gözəlin eşqindən zar olmadığı halda nə üçün sübh hər gün başını açıb, yaxasın yırtır (yəni, səhər açılır)?

Sadiq bəyin buna cavab olaraq yazdığı beytin birinci misrasında ikinci misrada veriləcək sualının cavabı vardır. Bəlkə subh dağ olmuş sinəsini cahan əhlinə, bütün dünyaya nümayiş etdirmək istəyir:

Ta edə rövşən cəhan əhlinə dağ sinəsin,
Hər səhərgahını neyçün yakasın yırtar sübh? (3,s.895).

Qeyd etməliyik ki, Sadiqi sübhün gəlişini Füzuli səviyyəsində poetik şərh etməmiş, sadəcə bu hadisənin əsl möcüzə olduğunu demişdir:

Hər nəfəs gündin yədi-beyza edər izhar sübh,
Belədür dəvayi-ecaz etsə Musavar sübh (3,s.895).

Şairə görə sübhün gəlişi adi bir təbiət hadisəsi deyil, möcüzədir. Bu, Musa peyğəmbərin ağ əli ilə göstərdiyi möcüzələrə bənzəyir. Sonuncu beytdə yaşadığı dövrə qarşı münasibəti tənqidi olan şair yalançı nikbinliyə inanmadığını bildirir:

Sadiqi, aldanma dəhrin zövqi-sübhü şamına
Kim gedər besyar şamü həm gəlür besyar sübh (3,s.895).

Sadiq bəy dəhrin, dövrün boş vədlərini, sabahkı günün daha yaxşı olacağına dair nikbin fikirləri əsassız sayır. Bu şeiri bir daha şairin lirikasında ictimai motivlərin mühüm yer tutduğunu göstərir.

Füzulinin «Görüb» rədifli qəzəlinə yazdığı nəzirədə Sadiqi dahi şairin 7 beytlik şeirindəki 8 həmqafiyə sözdən 6-sını təkrar etmişdir. Buradan görürük ki, Sadiqi tamamilə Füzuli poeziyasının, onun bədii məntiqinin təsiri altındadır. Beytlərindən birində Füzuli aşiqi müalicə etmək istəyən təbibin onun pərişan halını görüb, əlac edə bilməyəciyini başa düşərək fikrindən vaz keçdiyini deyir:

Eyləyən təyini-əczayi-müdava dərdimə,

Tərk edib, cəm etmədi, hali-pərişanım görüb (4, s.68).

Sadiqi isə nəzirəsində rəqibin onun pərişan halını gördükdən sonra xatirini cəm etdiyini, özünə gəldiyini deyir. Rəqibini sakitləşdirdiyinə görə o, şaddır:

Gər pərişanəm, vəli şadəm ki, eşqindən rəqib,
Xatirin cəm eylədi hali-pərişanım görüb (3,s.905).

Sadiq bəyin Füzuli təsiri altında olduğunu göstərən əsərlərindən biri də onun dahi sənətkarın «Mənəm ki, qafiləsalari-karivani-qəməm» misrası ilə başlanan 9 bəndlik tərkibbəndinə cavab olaraq yazdığı 7 bəndlik «Mənəm ki, sakini-meyxaneyi-diyari-qəməm» misrası ilə başlanan şeiridir. Hər iki əsərdə bəndləri birləşdirən vasitə beytlərlə birlikdə bəndlər 6 misradan ibarətdir. Füzulinin tərkibbəndi onun həyata, cəmiyyətə, bu cəmiyyətdəki öz vəziyyətinə münasibətinin bariz ifadəsidir. M.Quluzadə bu əsər barədə yazır: «Füzuli özünü qəm karvanının qafiləsaları, möhnət və ələm səhrasının müsafiri adlandırır. Lakin bununla bərabər, şair məğrur və nikbindir; özünü heç kəsdən əksik bilmir. O, padşah kimi fəqir, möhtəşəm bir gədadır. Dövlət onu şad etmir. Onun sərsəri könlündəki vəfa, gözlərindəki ləlü gövhər xəzinəsidir. Şairin dərin fəlsəfi mənaya malik olan bu misraları sərvət, şöhrət, ictimai ədalətsizlik üzərində qurulmuş cəmiyyətə qarşı qüvvətli bir etiraz kimi səslənirdi» (8, s.220).

Tərkibbəndində «Mənim ki, gəzmədi hərgiz sipehr kamımla» (2, s.915) deyən Sadiqi həyatından narazı olduğunu bildirir. Onun da ən böyük şikayəti zəmanədəndir:

Nədür zəmanə işi, cövrilə cəfa etmək,
Sipehr şivəsi təğyiri-müddəa etmək,
Rəqib dərdi-dilin bilməyüb dəva etmək,
Məni ki, dərdi-dilim sərbəsər cəza etmək (3, s.915).

Şair zəmanə cövrünə qarşı müdrik olmağı, ruh düşgünlüyünə düşməməyi məsləhət görür:

Könül, zəmanədən incinmə, şadü xürsənd ol,
O aqil irməz isə, bari sən xirədmənd ol (3,s.915).

Sadiq bəyin bu bəndi məzmunca Füzuli tərkibbəndinin sonuncu bəndinə yaxındır. Füzuli dövrünün bəlalarından, cəfalarından danışdıqdan sonra şikayət etməməyə, səbrli olub dua etməyə üstünlük verdiyini bildirir. Nəhayət, öz-özünə şikayət etməkdənsə, dostlarla ünsiyyətin daha yaxşı olduğunu söyləyir:

Kim ola dust rizası həmin sənə hasil,
Rizayi-dustdur əsli-təməttö', ey qafil! (4, s.335).

Sadiq bəy üçün də dostun varlığı, onunla dərdləşmək çox vacibdir. Şeirinin sonuncu bəndində o dərdini izhar etmək üçün bir dostunun olmadığından gileylənir:

Nə bir rəfiq ki, rəf'i-məlal edəm naçar,
Nə bir təbib ki, dərdi-dil eyləyim izhar (3, s.916).

Qeyd etmək lazımdır ki, Sadiqi digər şeirlərində də dostluqdan xüsusi olaraq danışmışdır. Ona görə, insanın dünyada yaşaması üçün ən mühüm şərtlərdən biri dostunun olmasıdır. S.Əfşarın əsərlərnidən onun dostlarını çox yüksək dəyərləndirdiytini, onlardan çox şey öyrəndiyini ustadlarına da dost kimi yaxın, mehriban münasibət bəslədiyini, çoxsaylı şəxslərlə dostluq etdiyini görürük. Şairin «Saqinamə və bərxi əz şikayəti-ruzigar quyəd» başlıqlı məsnəvi formasında yazdığı şeirində onun dostları ilə mənəvi bağlarının necə güclü olduğunu görürük. Saqinamələrdə ənənəvi olan Saqiyə müraciətdən sonra şair qəmli və tək olduğundan, dostlarının onu tərk etdiyindən şikayət edir, ötən günlərini xatırlayır:

Getdilər həmdəmü həmrazlarım,
Dərdü qəm bəzmida dəmsazlarım…

Qanı onlar ki, xəvasım idilər,
Xəlvəti-xasdə xasım idilər (3, s.910).

Məzmunundan şeirin Sadiq bəyin ömrünün son çağlarında, onun uzun müddət xəstə olduğu zamanlarda yazıldığını görürük. M.Muradova bu şeir barədə yazır: «O, dərdə-qəmə tutulduğu günlərdə uzaqlaşan dostlarını vəfasızlıqda təqsirləndirir. Şairə görə dost dostuna dar günündə qəmxar olmalı, yoldaş, sirdaş olmalıdır. Bu xasiyyət dostlarda yoxdursa, onda dostluqdan, yoldaşdıqdan söz açmaq yersizdir» (9,s.88). Fikrimizcə, Sadiqi ömrünün sonlarında yazdığı bu şeirində ən çox dünyadan getmiş dostlarının yoxluğundan, yanında olmadığından təəssüflənir. «Yarlar yarlığı böyləmi olur? Yar qəmxarlığı böyləmi olur?» (3,s.911)-deyən şair daha çox ötən günlərdə ona yaxın olan, artıq dünyasını dəyişmiş adamları yadına salır. Təsadüfi deyil ki, o adlarını çəkmədiyi ustadlarını xatırlayır:

Qanı ol piri-rəhi-irşadım
Ki, hər işdə bar idi ustadım (3,s.911).

Məlum olduğu kimi, Sadiqinin ən müxtəlif sahələrdə görkəmli müəllimləri olubdur. Ömrü boyu ustadlarına minnətdar olan şair onlarla mənəvi yaxınlığını itirməmişdir. Sadiq bəyin rəssamlıqda müəllimi dövrünün görkəmli sənətkarı Müzəffər Əli, şeirdə isə Mir Sün'i və başqaları olmuşdur. «Məcməül-xəvas» təzkirəsində S.Əfşar Mir Sün'inin qoca yaşlarında belə istirahət etmədən çalışdığını heyranlıqla qeyd edir: «Şeir sənətində bəndənin – mənim yol göstərənlərimdəndir. Şeirin mühüm risalələrinin əksəriyyətini Mir həzrətlərinin yanında oxumuşam. Üç ildən artıq bir müddətdə başını balışa qoyub istirahət etdiyini görmədim. Baxmayaraq ki, yaşı doxsana yaxın idi» (2, s.99).

M.Muradova Sadiq bəyin digər bir ustadı barədə yazır: «Sadiqinin rübai ustası Xacə Ağamirlə də yaxınlığı olmuşdur. Belə ki, Ağamir yazdığı şeirləri ilk dəfə Sadiqiyə oxuyarmış» (9, s.30). Bundan başqa, şairin həmədanlı Fəzainin tələbəsi olduğu, ilk gəncliyində şeirlərini Hafiz Sabuniyə təshih etdirdiyi barədə də məldumatımız vardır (5, s.20). Fikrimizcə, şair dostlarının yanında olmadığını deyərkən əsasən belə insanların dünyanı tərk etməsindən qəmləndiyini bildirmişdir. Şeirdə onlar barədə oxuyuruq:

Yarlığ birlə tutarlardı əlim,
Dürüb istərlər idi dərdi-dilim.

Tiri olduqca dilara idilər,
Öldüğüm dəmdə Məsiha idildər.

Qanı ol əhli-vəfalar, qanı?
Mə'dəni-cudü-səxalar qanı? (3,s.911).

Şairin «Şərhi-məlal» adlandırdığı 42 beytlik bu əsərində dövrandan şikayət də əksini tapıbdır:

Şimdi kim, saldı ayağdan məni çərx,
Bolmasun heç kişinin düşməni çərx (3, s.911).

Sadiq bəyə görə artıq dünyada bir mərd insan qalmamışdır:

Dəhrdə qalmadı bir mərdanə,
Hərfi-sövtilə keçər əfsanə (3, s.911).

Şeirin sonunda müəllif yenə də saqiyə müraciət edərək, onun lütfü, meykədənin abü havası ilə təsəlli tapdığını söyləyir.

Sadiqinin şah Abbasa halını ərz etdiyi 34 beytlik, məsnəvi formasında türkcə şeiri də onun ömrünün İsfahanda yaşadığı son dövrlərinə aiddir. Buradan şairin

həmin vaxtlardakı vəziyyəti, səhhəti barədə bəzi şeylər öyrənirik:

Şah Təbrizə əzm qılğanda,
Əzm ilqarı cəzm qılğanda.

Bəxt sahibi-fəraş qıldı məni,
Mərəzə xacə taş qıldı məni.

Eylədi dur xaki-rahindən,
Saldı iraq məni sipahindən.

Şimdi üç ildən füzundur məni-zar
Ki, gəhi sağəm və gahi bimar (3, s.912-913).

Burada şahın Təbrizə səfər etdiyi vaxtdan söhbət gedir. Sadiqi xəstələndiyi üçün səfərdə iştirak edə bilməmiş, qoşundan uzaqlaşdırılmışdır. Şairin üç ildən artıq xəstə olduğunu öyrənirik. Sadiq bəy bir dəfə Şah Abbasın əmri ilə müalicə olunsa da, vəziyyətinin yaxşılaşmadığını xəbər verir, şahdan dərdinə əlac edilməsini xahiş edir.

S.Əfşarın türkcə şeirlər toplusundan sonuncu əsəri şah sarayındakı bir qopçubaşıya müraciətən yazdığı qitədir. Məzmunca həcv olan bu şeirdə müəllif şah fərmanına riayət etməyən dövlət məmurunun özbaşınalığını kəskin tənqid edir, onu əhli-şər adlandırır:

Mən şamlu fəqiriyəm, sən qəcər bəgi,
Sən əhli-şərsənü sana bir əhli-şər gərək (3,s.917).

Özünü şamlu fəqiri adlandıran şair qacar elindən olan qorçubaşının yadına salır ki, şahın hökmünə boyun endirməyənin boynu vurulmalıdır:

Abbas şah hökmünə endirmədin boyun,
Boynu yoğunlusan, sana tiğü təbər gərək (3,s.917).

Sadiqinin türkcə şeirlərində daha çox dünyəvi məhəbbətin, real insani münasibətlərin, dostluğun,

insanlar arasındakı mənəvi bağların təsvirini görürük. Müxtəlif dini təriqətlərdən uzaq olan şairin əsərlərində təsəvvüf eşqinin mədhinə rast gəlmirik.

Lirikasında həyatı sevən, lakin ətrafındakı haqsızlıqlara göz yummayan istedadının, xidmətlərinin yetərincə dəyərləndirilməməsindən narazı olan, bununla bərabər təmkinini, müdrikliyini itirməyən Sadiqinin məğrur səsini eşidirik.

Klassik ədəbiyyatı, orta əsr Şərq poetikasını yaxşı bilən S.Əfşar əsərlərində bədii ifadə vasitələrindən, təşbih, istiarə, məcaz, təzad, cinas, təkrir, bədii sual, təlmih, təşxis və s. poetik fiqurlardan məharətlə istifadə etmişdir. Bədii ifadə vasitələrinin köməyi ilə Sadiq bəy lirik qəhrəmanının daxili dünyasını, ruhi aləmin inandırıcı, səmimi və təsirli boyalarla verə bilmişdir.

Təşdehlər bütün klassik ədəbiyyatımızda olduğu kimi, Sadiqi yaradıcılığında da önəmli rol oynayır. Şeirlərindən birində şair eşqi canına düşmüş oda, sümüyündəki iliyini yandıran şama bənzətməklə təşbeh yaradır:

Yenə nə bərq idi kim, saldı eşq canımğa
Ki, tüşdü şəm kibi məğzi-üstüxanımğa (3,s.897).

Bəzi təşbehləri yaradarkən müəllif canlı danışıq dilindən gələn söz və ifadələrdən istifadə edir. Sevglisinin yanında hörmətdən düşdüyünü bildirərkən o, «yanında itcə etibarım qalmadı» (3,s.895)-deyir. Bir it qədər mənasını verən «itcə» sözü ilə təşbeh yaradan şair bu sözü danışıq dilindən poeziyaya gətirməklə cəsarət nümayiş etdirir.

İstiarələr Sadiqi lirikasının ən mühüm bədii ifadə vasitələrindəndir. Məlum olduğu kimi, istiarədən istifadə zamanı hər hansı bir predmetin, hadisənin əlaməti həmin predmetin, hadisənin adı çəkilmədən başqasna köçürülür. «Verür ləliyə nisbət Xızr suyun Sadiqi yarın» (3,s.896)-misrasında məşuqənin dodağı ləl

adlandırılaraq Xırzın içdiyi dirilik suyuna bənzədilmişdir. Dodaq əvəzinə «ləl» sözünü işlədən şair istiarə poetik fiqurundan istifadə etmişdir. Başqa bir yerdə «Cəhan gülzarının xəndan gülü bərbad olur axır» (3, s.909) – deməklə Sadiq bəy insanların yer üzündəki həyatının gec-tez sona çatacağından, insan həyatının müvəqqəti olduğundan danışır. Burada «cəhan gülzarı» ifadəsini qeyri-müstəqim mənada, həyat anlamında başa düşmək lazımdır ki, bu da istiarənin əlamətidir.

Sadiqi yaradıcılığında ləffü nəşr şəklində sözişlətmədən geniş istifadə olunur. Bu zaman beytin birinci misrasındakı sözlər növbəti beytdəki sözlərlə əlaqələndirilərək izah edilir:

Yüz dövrə əgər eyləyə Yüsif, sənə yetməz,
Məqdurmidir yetməsi xurşidə məhanın? (3,s.905).

Birinci misrada lirik qəhrəmanın sevgilisi Şərq ədəbiyyatında gözəllik rəmzi olan Yusiflə müqayisə edilir. İkinci misrada Yusif məhə-aya, məşuqə (sən) isə günəşə bərabər tutulur. (Məlum olduğu kimi, klassik ədəbiyyatda Yusif həm də mahi-Kənan-Kənan ayı adlandırılır). Təbii ki, belə əlaqələndirmə zamanı məşuqə Yusifdən daha üstün çıxır: Məgər ay da günəşə bərabər olarmı?

Başqa bir misal:

Gər xəyalı gəlməsə, gözdin qılay qət'i-nəzər,
Sadiqi, hərgiz bu evi mehmansız körməyin (3,s.903).

Birinci misradakı «xəyal» və «göz» ikinci misrada «ev» və «mehman» sözləri ilə əlaqələndirilir. Şair poetik məntiqlə aşiqin gözünü bir evə bənzədir. Ona görə bu gözün – evin mehmanı, qonağı – gözəlin xəyalı olmasa, onda bu gözün heç bir mənası qalmır.

Sadiq bəyin yaradıcılığından gətirdiyimiz bu iki nümunə qarışıq (müşəvvəş) ləffü nəşrə aiddir. Çünki birinci misralardakı aydınlaşdırmaya ehtiyacı olan

sözlərlə aydınlaşdırıcı sözlər eyni sırada, eyni fəqərədə deyil.

Digər şairlər kimi, Sadiq bəy də fikrini daha təsirli etmək məqsədi ilə hər hansı bir hadisəni, keyfiyyəti şişirdərək mübaliğə bədii ifadə vasitəsindən geniş istifadə etmişdir:

Göz yaşını vermə qəmi-ahi-səhərgahlərə,
Yanar əflak könüldən çəkilən ahlərə (3,s.902).

Şair özünə eşqinin dərdindən səhər çağı göz yaşı axıdıb, ah çəkməyi məsləhət görmür. Çünki könüldən çəkilən ahdan fələklər yana bilər. Burada istər-istəməz Füzulinin «fələklər yandı ahimdən» sözləri yada düşür.

Fəzayi-kuyinə qoy seyri-əzm birlə qədəm
Ki, zahir eylədi hər yanda laləzar gözüm (3,s.907).

Şair sevgilisini ətrafı seyr etməyə dəvət edir. O, yarının qapısında o qədər ağlamışdır ki, indi onun yaşadığı evin hər yanı laləzara çevrilmişdir.

Təzad sənətindən də Sadiq bəyin poeziyasında fikri daha poetik, təsirli ifadə etməyin vasitəsi kimi istifadə edilmişdir:

Bu gün nihan səri-kuyinə gəlmişəm, ey dil,
Nihani ah çəkib aşkar qılma məni (3,s.901).

Müəllifin lirik qəhrəmanı ürəyinə müraciətlə deyir ki, bu gün gizlincə yarının yaşadığı yerə gəlmişdir, nihani-gizlincə olsa da, ah çəkib onu aşkar etməsin. Əks mənalı «Nihan» və «aşkar» sözlərinin bir misrada işlədilməsi təzad sənətinin əlamətidir. Sözünün təsir gücünü artırmaq üçün şair təkrirlərdən də məharətlə istifadə edir:

Bu gecə can təndə mehmandur mən ilən, ey rəfiq,
Bu gecə cananım da mehmanda bolğay kaş ki (3,s.900).

Sözlərin misraların başlanğıcında təkrarı dilçilikdə leksik anafora adlanır.

Cinaslar Sadiqinin uğurla işlətdiyi bədii ifadə vasitələrindəndir:

Gözünün mərdümi mərdümlik edib mane olur,
Hər qaçan qətlim üçün tiğ çəkər müjganın (3,s.898).

«Mərdüm» sözü həm göz bəbəyi, gözün qarası, həm də insan, adam mənalarında işlənir. Beytdə deyilir ki, hər dəfə gözəlin kirpikləri aşiqi öldürmək üçün xəncər çəkəndə onun gözünün mərdümü-qarası mərdumlük – insanlıq edərək buna mane olur. Burada «mərdüm» sözünün köməyi ilə cinas yaradılmışdır.

«Gördü məni, ağlar üzümə gül kimi güldü» (3, s.905) misrasında «gül» sözünün həm çiçək, həm də gülmək mənalarnı bildirməsindən istifadə edən şair cinas yaratmışdır.

Sadiq bəy şeirlərində hüsni-təlil bədii ifadə vasitəsindən dəfələrlə istifadə etmiş, bunun köməyi ilə bir sıra gözəl poetik obrazlar yaratmışdır. «Səbəb və bəhanə gətirməyin gözəlliyi» demək olan hüsni-təlildən istifadə zamanı bir əlamət və ya keyfiyyət, başqa əlamət və ya keyfiyyətin meydana gəlməsinə səbəb olur. Nəticədə ikiqat təsvir özünü göstərir.

Kəsrəti-şəbnəmlə olmuşdur libası cümlə yaş,
Günə qarşu hər dəm anınçün açar dəstar sübh (3,s.895).

Beytdə deyilir ki, şəmbənim –şehin çoxluğundan sübhün libası tamam yaş olmuş, buna görə də o, öz dəstarını-əmmaməsini günə qarşı açmışdır. Burada poetik bir tərzdə sübhün açılmasından bəhs olunur.

Sadiqi yaradıcılığında hüsni-təlil sənətindən istifadəyə dair daha bir nümunə:

Bir kərrə turub qibleyi-rüxsarinə qarşu,
Həsrətdən açıq qaldı gözü qiblənümanın (3,s.905).

Aşiqin qibləsi olan gözəlin üzünü bir dəfə görən qiblənümanın – kompasın həsrətdən gözləri açıq

qalmışdır. Şairin bədii məntiqinə görə kompasın şüşə gözləri ona görə qapanmır ki, o, gözəlin həsrətini çəkməkdədir. Burakı «qiblə» və «qiblənüma» sözlərinin köməyi ilə naqis cinas yaradılıbdır.

Sadiq bəyin təşxis sənətindən istifadə etmək məharətini onun qəsideyi-şitaiyyəsindən danışarkən qeyd etmişik.

Sadiq bəy Əfşar doğma dili gözəl bilən, onun zəngin xəzinəsindən bacarıqla istifadə edən şairdir. Əsərlərini oxuduqca onun doğma dilin söz və ifadələrini yerli-yerində işlətdiyinin, dilin incəliklərinə bələdliyinin şahidi oluruq.

Fikrimizcə, Sadiqinin türkcə şeirlər toplusunun bu ilk nəşri XVI-XVII əsrlər ədəbiyyat və dil tariximizi araşdıranlar üçün maraqlı mənbələrdən biri olacaqdır.

Bu əsərin surətinin Təbriz Dövlət Kitabxanasından əldə edilməsində bizə kömək etmiş tədqiqatçı Rəhim Təbriziyə səmimi minnətdarlığımızı bildiririk.

**PAŞA KƏRİMOV,**
*filologiya elmləri namizədi*

**Ə D Ə B İ Y Y A T**

**1. Əfşar Sadiq bəy.** Qanun-üs-süvər. Giriş, farscadan tərcümə, qeyd və şərhlər: sənətşünaslıq doktoru Adil Qazıyevindir. Bakı: «Elm», 1971.
**2. Əfşar Sadiq bəy.** Məcməül-xəvas. Müqayisəli mətnin tərtibi, tərcümə, transfonoliterasiya, ön söz, izahlar və adlar göstəricisi: Əkrəm Bağırov. Bakı: «Elm», 2008.
**3. Əfşar Sadiq bəy.** Türkcə şeirlər. Külliyyat. Əlyazma (Fotosurət). Təbriz Dövlət Kitabxanası. №3616.
**4. Füzuli Məhəmməd.** Əsərləri. Altı cilddə. I Cild. Bakı: «Şərq-Qərb», 2005.

**5. Ganjei T.** Sadiki-i Afşar'ın Türkçe şiirleri». Türkiyat Mecmuası. XVI. İstanbul. Edebiyat Fakültesi Basımevi, 1971.
**6. Kərimov Kərim.** Sadiq bəy Əfşar. Bakı: İşıq, 1987.
**7. Quliyeva Mahirə.** Klassik Şərq poetikası və orta əsrlər Azərbaycan poeziyası. Filol.e.d.-diss. …nın avtoref.
**8. Quluzadə Mirzağa.** Füzulinin lirikası. Bakı: Azərbaycan SSR EA Nəşriyyatı, 1965.
**9. Muradova Məntiqə.** Sadiq bəy Sadiqinin həyat və yaradıcılığı. Bakı: Elm, 1999.
**10. Nağıyeva Cənnət.** Azərbaycanda Nəvai. Bakı: «Tural-Ə» Nəşriyyat-Poliqrafiya Mərkəzi, 2001.
**11. Navoiy Alişer.** Xazainül-maaniy. I cild. Qaraibus-siqar. Taşkent: Özbekistan SSR Fanlar Akademiyası Naşriyeti, 1959.
**12. Nəsrabadi Məhəmməd Tahir.** Təzkireyi-Nəsrabadi. C.1.Tehran, 1378.
**13. Tərbiyət Məhəmmədəli.** Danişməndani-Azərbaycan. Bakı: Azərbaycan Dövlət Nəşriyyatı, 1987.

## QƏSİDƏLƏR

İrişdi vəqt ki, rəf ola etidali-həva,
Çəkə büsati-çəməndən ayağ nəsimi-səba.

Çəmən zərifləri künci-inzivayə girib,
Mürəttəb etdilər əsbabi-bəzmgahi-cəfa,

Mətai-məxzəni-bustanı etdilər tarac,
Hücumi-sərsərdi-bürdbürd badi-fəna.

Füsürdə oldu çəmən bəzmi çıxmağa bir kəs,
Səbayə guşeyi-çeşm ilə eylədi ima.

Degil xəzan vərəqi lövn-lövn gülşəndə.
Biri kəbudü biri əsfərü biri həmra.

Mürəttəb etdi sədəflər zəmanə nəqqaşı
Ki, ola güllərə fəsli-bahar çöhrəguşa.

Dağıtdı seyrəfiye-dey şükufə dirhəmini,
Rəvac tapdı tilsimati-Bu Əli Sina.

Şükufə olsa pərişanü müztərib, nəşekoft,
Çinarü söyütü ki, bidəstü pa edər sərma.

Yeritməz oldu çəmən içrə cuybar suyun,
Daş oldu möcüzi-sərma ilən bu əjdəha.

Yetişdi şiddəti-bürudətlə öz cərasinə,
Bənəfşə ilə müqabil duran zəbani-nəfqa.

Həvayi-gülşən üçün ruzigar memarı,
Hübabdən yasadı öylə üstüvar bina

Ki, yoxdur ona xələl ruzigar babından,
Yıxılsa fərşi-zəmin üstə bargahi-səma.
Çavurdu gül yüzünü qibləgahi-gülşəndən,
Cəfadən olsa müsəlman əcəbmidür tərsa.

Hicabi-çöhreyi-gül kəsdi əndəlib dilin,
Nə bərg qaldı çəmən bəzmgahında, nə nəva.

Kəsildi rəsmi-təvəllüdləri kim, etməzlər,
Müvasilət həvəsin ümməhat ilən aba.

Səvadi-səbzədə su şəhnəsi sibqət ilə,
Müqimi-gülşən ilə bəs ki, eylədi qovğa.

Həva xonək hərəkatilə söylədi ki, dağ,
Çəmən cəmaətinə hökmin eyləyə içra.

Həva bənəfşə ilən öylə rəşədar etdi
Kim, üstüvar degil bir nəfəs əlində əsa.

Hərəmsarayi-çəməndə lətif cariyələr
Ki, dar idi bari gülçöhrəvü səmənsima.

Dəmi-təsərrüfi-sərma ilə yox onlarda,
Bu gün bənəfşəvü reyhan təfavüti əsla.

Həva hədiqəvü büstanın eylədi xali,
Bu vəchilən mütəğəyyir olur vücudi-xəla.

Nişat ilən çəmən ətfalı getdilər bir-bir,
Məgər bənəfşə kim etdi həca oxur da xəta.

Kəbud etdi binaquşi müəllimi-dey,
Ona tapançeyi-bərd ilə bəs ki, urdu qəfa.

Həva təhərrükindin biqərardur, ey sər
Ki, sürət ilə rəvan eyləyə hürufi-heca.

Bu dəmdə gülşəndə basdım qədəm məni-məhzun,
Bəli, təbiətimi etdi münhərif sevda.

Hərifi-gülşənin gördüm nişatdən xali,
Vücuddən mütəərriz müqimi-kuyi-fəna.

Demə hədiqə muna, bir səvadi-kişvəri-Lut,
Demə çəmən muna, bir bisəbat köhnə səra.

Üburi-ləşkərdi, mülkin eyləmiş viran,
Hücumi-badi-fəna rəxtin eyləmiş yəğma.

Olub nəsimi-səba gülbənə təvəhhüli-hal,
Tutub səmum məzacın həvayi-ruhfəza.

Xonək ədalərilən qönçə könlüni yığmış,
Bəsi xonək görünür əhli-xalidin bu əda.

Demə səba muna, bir köhnə möhtəsib şagird,
Demə nəsim muna, bir hərifi-cövrü cəva.

Gördün, gördün bu əsəspişələr miyanındin,
Töküb piyalə gülü qönçə, sındırıb mina.

Füsürdə hər biri bir guşədə, pərişanhal,
Nə nəşv mənzili munlarda, nə təriqi-nüma.

Bu halət içrə gözüm tutdu peyrovi-azadə,
Biri-birinə münasib tərakibi-əcza.

Təriqi-cilvəsi həvəsi-mülayimül-hərəkət,
Ədası, nazü dili, xürrəmü-qədi rəna.

Təəccüb ilə sorub istədüm, dedim ki, neçün,
Həvası xəzan bir cəmaətdin etdi müstəsna.

Nədən sana bu cəmaət edər səhiduni,

Nədən sana bu rəayət edər rəğmi-səba.

Zəbani-hal ilə ayıtdı ki, ey məğbulhal,
Həngamə eyləyə əhadisi-hadisati-qəza.

Bu dövrü belə məni dur etdisə məaf,
Bu dövri-səbəb məni əyyam eylədisə səva.

Gəh bari-müşabehəti…. qamətə kim,
Urar unətü naz ilə çərxə istiğna.

O kim, bəla ilə zəxmi-canə tökdü nəmək,
O kim, səbah ilə mehrü mahə verdi səba.

O kim, üzarı salır gülşəni-lətafətə od,
Səvadi-xətti edər müşki-Çin yüzini qəra.

O kim, məhəbbət ilə etdi o dəliri əsir
Ki, var məhabət qəhri məhaliki-əda.

* * *

## … ŞAHI-VILAYƏTI ƏLI ƏLI SULTAN HƏR BIR BIŞƏ KIN ŞIRI-GIRI-BƏZMI-HICA

Şekoft imas ki, nəsimi-səxavət ilə bu gün,
Bənəfşə qamətidin getsə əzayi-əna.

Əcəb degil ki, əgər qılsa zərrəpərvərlik,
Yetə üruc məqamında aftabə səha.

Nə söz əgər diləsə xatiri təvazö ilə,
Edər sipehr sərəfraz qamətini düta.

Şüayi-şöleyi-tiği, lütfi-iclali,

Müqəvvi tutar azərü nümayişi-ma.
Şicaətü kərəmü lütf xülqdür bizzat,
Kişi neçün edə şərhi-sifatini inşa.

Bu gülşən içrə olursa həzar dastan tək,
Nəvayi-mədhi ilə Sadiqi sürudsəra.

Yəqin ki, acizi-mədhi-ədanı mədhidir,
Onun ki, edə kəlamın duası birlə əda.

Həmişə ta ola dərdmənd sərsərdi,
Müdam ta edə fəsli-bahar ona dəva.

Gül səadətinə irməsün nəsimi-xəzan,
Bahari-mərtəbədən olmasun nihalı cüda.

* * *

Əgər sərgəşteyi-dəhr eylədi dövran məni-zarı,
Xoşam kim, hasilimdür hər zəman bir şux didarı.

Sevdigim, gər biqərarəm, ahu əfğandur işim, şadəm
Ki, hər saət tutub seyr eylərəm bir səhni-gülzarı.

Degil hər qanda isə bəhri-əşkim gövhəri zaye,
Qoyarlarmı bəsirət əhli yerdə dürri-şəhvarı.

Əgərçi dağdarəm qərib ilə çərx hər saət,
Mana mənzur edər hər qanda bar bir lalə rüxsarı.

Əgərçi təlxkaməm, möhnət ilə hər zəman eylər,
Zəmanə həmzəban kamimcə bip ləli-çəkərbarı.

Qərari-istiqamət verməddüm öz ixtiyar ilə

Ki, əldən ixtiyarım eyləyib bir şux rəftarı.

Bana cövr eylədükcə qeyri-canan mərhəmət eylər.
Ola tək Tarı yar, əda olur ə'vani-ənsari.
Məni bu qəhr ilən hər yar görsə, mehribanımdur,
Bəli, hər ruzinə tutar xurşid ənvarı.

Bana yar olmasaydı xublər mehri bu qürbətdə.
Şəmatət yolundin kim, döndərərdi çərxi-qəddarı.

Könül şad eylərəm bir söz ilə növhə budur,
Qaçan azad olur qəm qeydidin qürbət giriftarı.

Əgər qürbətdə xarəm, izzətim yox, ariyəm qəmdən.
Anınçün kim, qürbətin xarlığındin yoxdur ari.

Bu istedad ilə dövran bəni eylərmidi mövcud,
Əgər bilsəydi bu canbin cəhanda var xiridarı.

Bəni xar etmək üçün qürbü vəsli qeyrə tapşırdı,
Çəmən içrə, bəli, bihudə dehqan bəkləməz xarı.

Məni-üftadəni, ey dəhri-dun, hər dəm basıb keçmə,
Qəribin gərçi deyərlər pəst olur hər yerdə divarı.

Səzavari-məhəbbətdür ədu bəzmi-fəraqətdə,
Mənimi gördün, ey çərxi-fələk, möhnət səzavarı.

Cəfa çox eylədün, dövran, mana, ərz eylərəm imdi
Ona dərdi-dilim kim, vardur, əhldir qəmxarı.

* * *

O kim, nüsrət verür nüğli-kəlamullah ehkamı,
O kim əvan olur şər'i-nəbiullah göftarı.

Zehi şahi-cahanarayi-adil, mürşidi-kamil,
Münasibdür süluki-qürbi-həqqə cəm'i-ətvarı.

Olur ə'davü istedaddin etmək rüb'i-məskunum,
Sayılsa qətreyi-baranivü övraqi-əşcarı.
Cəhanarayi-təxti günbədi-əflak bünyadı,
Nişatəfzayi-təxti bünyeyi-islam memarı.

Şəha, sən xabgahi-kamə salgil məsnədi-işrət
Kim, etdi çərx dərgahində hadis bəxt bidarı.

Yetişdi ol yerə ədlin ki, rəsmi-istiqamətdə,
Özinə tabe eylər istəsə çərxi-sitəmkarı.

Cəhanda küfr zülmün sən yox etdün, varmış derlər,
Sənin dövründə möhkəm küfri-islamın yox dəvvarı.

Üqabi-tizpərdin özgəsidə eyləməz rəğbət,
Himayət eyləsə səyyad əmrin kəbki-kühsarı.

Səhih irmasdur Əflatun hədisi bu bir ayindir,
Sənin şanında etmiş dəxi nazil elmi-ədvarı.

Hicabliqdin pərdeyi-xiclətdə qalmışdı,
Çıxardı pərdə şəxsi-halın bikri-əşarı.

Elə xar elədi təb'i-kərəmin simü zər cinsin

Ki, mərdudi-təbaye etdi dirhəm birlə dinarı.

Degilsə sən bilən şər'i-nəbi ehkaminə qabil,
Olur zöhd əhlinin boynundakı təsbihi-zünnarı.

Əzəldən gər işarət olsaydı təb'i-fəyyazın,
Çəkərdi bir söz ilə sərhəd ara əmri-küffarı.

Şəha, şəfqət şüara sahiba dərdi-dili çoxdur,
Nə izhar eyləyim, yaxşı degil dərdi-dil izharı.

Fələk kim, rəsmi-fitridür, ona tigi-cəfa birlə.
Müdam azürdəxatir etmək üşşaqi-diləfkarı.

Məni sərgəştəlikdən hərgiz idbar sanmışdı,
Xəti-rahət çadırdı çevrəmə iqbal pərgarı.

Sana gəldüm dili-bitaqət bir arzu birlə
Ki, varsan binəvalər sərvəri, əhli-hünərbarı.

Qərəz, tuli-məkan, qibleyi-məqsudum sənsən,
Degildür haşallah, Sadiqi dünya pərəstarı.

* * *

Dəhr dərmandələrdən müşkili asan eylər,
Hicr ilə dərd birdir, vəslilə dərman eylər.

Gəh xəzan birlə çəmən nəqdini eylər qarət,
Gah gülbərgilə bustanı zərəfşan eylər.

Gah verür gərdiş ilə nərgisə dövri-qədəhi,
Gəh nəsimi-səhəri saqiyi-dövran eylər.

Bağ ara səbzə büsatı salıb cay be cay,

Qönçə ətfalinə tərbiyəti-dəbistan eylər.

Rəhl şah üzrə açar qönçeyi-gül dəftəri,
Bülbüli-nadirə göftari səbəqxan eylər.

Bağ tərəfində çəkər abi-rəvan cədvəl salıb,
Gör nə zinət ilə zibi-xəti reyhan eylər.

Bülbüli məzhəkədür kim, şəcər zi şax be şax,
Bu rəviş birlə görün gülləri xəndan eylər.

Yandırar lalə çırağını məgər gülşən ara,
Bağ həmdəmlərinə şəm'i-şəbistan eylər.

Bağban gülşən ara suyə veribdür rüxsət
Kim, gəzər suy besuy, gəşti-gülüstan eylər.
Çənd, ey fələk birgə feyzi-əsərin,
İstəsə bağü taşı ləli-dirəxşan eylər.

Bəhr ara əbr tökər gər qətreyi-dust kərəmin,
Sədəf ağzunda onu lölöyi-qəltan eylər.

Hikmətin tərbiyət etmək dilər bağü amin,
Heç şək yox ki, Ərəstu ilə Loğman eylər.

Bəlkə «Qanun», «Şəfa» birlə əgər rağib olub,
Qılsa təşxis, ölüm dərdinə dərman eylər.

Su verur təşnələb vadiyi-cəhan bəni,
Bəs neçün süxteyi-atəşi-cəhan eylər.

Gah edür möhnətü ənduhilə var səbri yox,
Gah az dərdimi cövrilə firavan eylər.

Dəhr ara gülşəni ümmid olun şaxləri,

Sındırır sərsəri əyyamü pərişan eylər.

Qorxuram kim, verə tufanə həyatım rəxtin,
Böylə kim, cövrimin didəmi giryan eylər.

Qorxuram cism ola badi-fəna həmsəfəri,
Böylə kim, ahi-dəmadəm yeli tüğyan eylər.

Kaş ki, tən qəfəsindin çıxa mürgi-nəfəsim,
Çün yerim cüğdsifət guşeyi-viran eylər.

Ey fələk, eyləmə çox cövr könül kişvərinə,
Həzər et böylə ki, dil naləvü əfğan eylər.

Mənşur naləsi ol bəhri-səxa səm'inə kim,
Rəyi-rövşən bilə hər müşkülün asan eylər.

Ol kərəmdir səxapişə ki, çün dəstü dili,
Xazəni-məxzəni-ənamına fərman eylər.

Bavücudi-kərəmi-bəhr ilə kan ol ikisin,
Bir kimin bəxşişi şərməndeyi-ehsan eylər.

Bir nomin əşcarın yürüdür sənə layiq,
Pərtövün təngi-kərəm, cigərin qan eylər.

Ol ki, gər tutsa bizə tərbiyəti-muri-zəif,
Əsəri-tərbiyəti muri Süleyman eylər.

Şahi-dərya dili-cəmca ki, çeşmi-bəd üçün,
Yoluna çərx həməl qoçini fərman eylər.

Təb'i-fazilə kim, söz suyinə verdi həyat,
İstəsə çeşmeyi-heyvanı süxəndan eylər.

Nəzəri cismə iksiri-bəqadır, nə əcəb,
Qara torpağı əgər çeşmeyi-heyvan eylər.

Gətür dirə hərimi-hərəmini şəm'i üçün,
Demə kim, şami-fələk şəm'ini pünhan eylər.

Div əgər busə edər rayiz əmrini qəbul,
Oturub məsnədi-izzətdə çü divan eylər.

Baxsa kəc həzmi-həsədpişə, əgər bəzmi barsa,
Həm onu edər baxışı kurü peşiman eylər.

Əzmi-meydan qılubən çıxsa səmənd üzrə fələk,
Bəbəyi ilə kuyi guy ilə çovgan eylər.

Ey sərəfrazi-fələk, rayinə qonmuş gərdun,
Eyləməz kim ki itaət, sana üsyan eylər.

Əridür xəsm cəfapişə yar qəzəbin
Kim, dürüşt olana aqça vəqtini suhan eylər.

Sərvəra, Sadiqi dəsti-cəfadən kərəmin,
Bir yari-lətif ilə tutarsa, nə nöqsan eylər.

Bəxşişün lütfilə qaldırmasa toprağdan onu,
Zə'f tale qara torpağ ilə yeksan eylər.

Tusəni-dövlət gər cilvəgər olsun, ya Rəb,
Ta səməndi-fələkün dəhrdə cövlan eylər.

* * *

## QƏZƏLLƏR

Hər nəfəs gündin yədi-beyza edər izhar sübh,
Belədür dəvayi-ecaz etsə Musavar sübh.

Mehridin guya ki, bir xurşidvəş yüz göstərir
Kim, nisar eylər həzaran lölöyi-şəhvar sübh.

Guyiya gəlmiş kənarına ömrünün günü
Kim, qılır hər dəm əyan mundaq sarıq rüxsar sübh.

Ta edə rövşən cəhan əhlinə dağ sinəsin,
Hər səhərgahını neyçün yakasın yırtar sübh?

Kəsrəti-şəbnəmlə olmuşdur libası cümlə yaş,
Günə qarşu hər dəm anınçun açar dəstar sübh.

Sadiqi, aldanma dəhrin zövqi-sübhü şamına
Kim, gedər besyar şamü həm gəlür besyar sübh.

* * *

Ağlamaqdan seyli-çeşmi-əşkbarım qalmadı,
Başa urmaqdan əlimdə ixtiyarım qalmadı.

Səndə yandırdı ahım etdigin ədəkləri,
Yandım onun üçün ki, bir dilsüvarım qalmadı.

Dərdmənd oldum qərari-çarə etdigin şükr üçün,
Çarə qıl kim, vaqi bu dərdə qərarım qalmadı.

Tə'n eyləməyibdir min günün bietibar
Kim, yanında itcə etibarım qalmadı.

Xoşdiləm sinəndəki qatı xədəngi-zəxminə,

Meyli-gülgəştü həvayi-laləzarım qalmadı.

Bar idi cəm'iyyətim, eşqinlə də kim ruzigar,
Seylə verdi olduğum ol ruzigarım qalmadı.

Bəs ki, yaxdı, Sadiqi, ahım odu həmdəmləri,
Şəm tək yanımda bir dilsuz yarım qalmadı.

* * *

Dün urub vaşilə bən xəstədili şad etdün,
Yaxşı bardun ki, bozuq könlümü abad etdün.

Yox vəfa cövrü cəfadin bəni  məhrum etmə,
Çünki cövr ilə cəfayə bəni mötad etdün.

Verdin əğyar əlinə meylini, yıxdın evimi,
Dad əlindən sənin, ey şux, nə bünyad etdün?

Hər nəfəs sövti-vəfa birlə edirsən nalə,
Ey könül, ol səgi-kuyini məgər yad etdün?

Eylədün, Sadiqi, təndin xali cananə fəda,
Yaxşı vardun, bu qəfəsdən onu azad etdün.

* * *

Yardin kam istəmək eşq əhlinə düşvar imiş,
Aşiqə məşuqdən məqsud bir didar imiş.

Gözlərindin günimi aldım, öpərdüm ləlinə,
Bilməz idüm ol daği edən tiri-xunxar imiş.

Tə'n edə təsbih ilə zahid bənim zünnarimə,
Eylədüm biruluq ol daği birər yar imiş.

Abi-kövsərdin bəni asudə qıldı cami-mey,

Heç şək yoxdur ki, xiffətxanə xümmar imiş.

Deyərdim hicran ilə olsam daği vəsli-səmən,
Neyləyim ki, çareyi-dərd istəmək naçar imiş.

Qeyrə zari-eşqimi demişdilər, bildin, rəfiq,
Bilməz idüm kim, mənə yardan deyən əğyar imiş.

Nəqdi-can verdüm ki, ta aldum mətai-vəslini,
Sadiqi, bu eşq sevdası əcəb bazar imiş.

* * *

Driğa, dilbərim halım pərişan olduğun bilməz,
Könül quşun əsiri-dami-hicran olduğun bilməz.

Gəzər ləli xəyal ki, kor edə gah könlümdə,
Buların arəsində ol məgər qan olduğun bilməz.

Bizi aşiq dad iman yox, zahid oxur kafər,
Nə cahildür kim, kafəri iman olduğun bilməz.

Bəni hicran bilə öldürən əsiri-yar müşküldir,
Məgər yüz göstərüb öldürən asan olduğun bilməz.

Gəzər könlüm evin, istər ki, mehrin alələr təkəllümdən,
Behəmdüllah ki, mehri canda pünhan olduğun bilməz.
Çəkibdür xəncərin bədgu söz ilə yar qılmaqçün,
Bəni bu öldürür ruzigar, axır peşiman olduğun bilməz.

Verür ləliyə nisbət Xızr suyin Sadiqi yarın,
Nə qafildür, onun əslini heyvan olduğun bilməz.

* * *

Müşk yolunda can tökən qəlb olması yəqinimdür,
Səvadi-cövhərimin xətti-lövhi cisminimdür.

Driga, heç kim qürbətdə bimar olduğum bilməz,
Bəla həmsöhbətim, qəm yarü möhnət həmnişinimdür.

Gözündən özgə yoxdur ağzıma süd əmizdirən,
Gözüm yaşım silən, dilim tutan yara sitəmimdür.

Nə yerdə olsa əğyar, eyləməz tərki-mülaqatın,
Yeridür gər desəm təri bu çeşmi-pakimdür.

Həlal et bənə söz sehrini, ey Sadiqiyi-dövran,
Deyəndən bərli canan şairi-əqrəbinimdir.

* * *

Yenə nə bərq idi kim, saldı eşq canımğa
Ki, tüşdü şəm kibi məğzi-üstüxanımğa.

Yenə nə seyl idi kim, yıxdı səbr bünyadın,
Gətürdi rəxneyi-qəm mülkü xanümanımğa.

Yenə nə şövq idi kim, kəsdi rişteyi-canım,
Buraxdı dami-bəla cismi-natəvanımğa.

Yenə nə gülbüni-vəsl idi kim, şüküftə bolub,
Bahar verdi xəzan bərli bustanımğa.
Yenə nə bərq idi, ey Sadiqi kim, oldu əyan
Ki, etdi şölə füzun atəşi-nihanımğa.

* * *

Göstərdi tiği-hicran rişteyi-ömrünü əhbabın,
Kəməndi-gərdəni-can olmasaydı zülfi-pürtabın.

Məgər məsti-meyi-vəsl ola könlüm bəzmi-işrətdə,
Vəgərnə ol qədər keyfiyyəti yox badeyi-minanın.

Degilsə qiblədən məqsud qədü qamətin görmək,
Nədür bəs sana qarşudur zövqi-məscidə mehrabın.

Mana fərmanın olmaq urdu lütf qılma eylərsən,
Nədəndü iltifatı o taqi-fərmanə qəssabın.

Mənim tək çərx əlindən hər zəman dönüb fəğan eylər,
Keşişdən bir havadardur məgər başında dolanın.

Nə nan kənar basar xublar mənim tək aşiqə talib,
Əcəmidədir tələbkarı çox olsa cinsi-kəmyabın.

Cünundin Sadiqi ol bəzmi-eyşin padşahidür,
Kim, onda fərq yox xakistəri-gülxənlə sübhanın.

* * *

Dərddin xanəvü beyt tutdum eymən cananın,
Xəncərin çəkdi miyanından ki, budur dərmanın.

Bəni-qəribi səgi-kuyin eşigindən qavdı,
Bu vilayətdə məgər qədri budur mehmanın?

Sinədən gör yolu tutdu sirişkim yerinə.

Dəmbədəm suzi-dilimdən iritin peykanın.
Qaşların payi xəm olduqca dəgər sinəmə ox,
Olmayımmı məni-sərgəştə sənin qurbanın.

Gözlərin mərdümi mərdümlük edib mane olur,
Hər qaçan qətlim üçün tiğ çəkər müjganın.

Kərəm etdin qəmu əğyarə vüsalın nəqdin,
Padşahım, qanı dərvişlərə ehsanın?

Biqərar etdi fələk dönə-dönə Sadiqini,
Şimdi bildim ki, qərarı yox imiş dövranın.

* * *

Gözə ol şəh yolidin özgə gubari bolmasun,
Məndin özgə kimsəgə andin güzari bolmasun.

Gülşəni-kuyində kim, sərvi-qədi məvasidür,
Hər tərəf əşkimdin özgə cuybari bolmasun.

Köyməsün könlüm evün bivəch, ya Rəb, hicr odu,
Təndə bərqi-vəsldin özgə şərarı bolmasun.

Məndin özgə bolmasun məhrəm hərimi-bəzmdə,
Tən nəmidin özgə onda pərdədarı bolmasun.

Müntəzir bol kim, gəlür qətlünğə dersən, ey rəfiq,
Hər nə bolsa-bolsun, əmma intizarı bolmasun.

Dedi kim, bəzmində bolsun pərəstkarı, Sadiqi,
Leyk meyli-işrətü busü kənarı bolmasun.

* * *

Dustlar, sərf eylərəm, nəqdi-vəfa bir yar üçün
Kim, edər yüz min cəfa hər dəm bana əğyar üçün.
Ayrılığ zə'fi bilən bəs kim, ölürmən dəmbədəm,
Tutdular yüz min kərəz[1] matəm məni-bimar üçün.

Yox sana lütfivü var əğyara dersən, ey rəfiq,
Necə bir könlüm məlul olsun bu yoxü var üçün.

Müşkili-düşvari-eşqə etmə tədbir, ey həkim,
Eyləməz tədbir ……… bu müşkili-düşvar üçün.

Bir qədəh mey birlə dün bəzmində rəf' oldu qəm,
Can fəda bolsun anın tək həmdəmi-qəmxar üçün.

Sadiqi, azürdə istər hər zəman canan səni,
Guiya xəlq eylədi xaliq səni azar üçün.

* * *

Çarə kimdür əlämi biçarə olmuş könlümü,
Qandadur bir cəm edən sədparə olmuş könlümü.

Cənnətü cuyi dil bəni avarə qıldı, bilməzəm,
Qanda, ya Rəb, istəyim avarə olmuş könlümü.

Etmə, zahid, vaizü təsbihə talib Tanruçün,
Mən' əsiri mübtəla zünnarə olmuş könlümü.

Yağıleydi nafə tək qan əşki-gülgün kaş ki,
Payvənd ol zülfi-ənbərbarə olmuş könlümü.

---

[1] Кяря, дяфя.

Sadiqi tək yandurun ey ahi-atəşbarını,
Arsızlıqda müti əğyarə olmuş könlümi.

* * *

Müddəi qövlilə çün kim salmadın gözdən bəni,
Saxlasun, ey sevdügim, Tanrı yəman gözdən səni.

Bənə dağ eylədi puşidə üryan cismimi,
Neylərəm, ey həmnişin, şimdən geri pirahəni.

Keçdi dün damən keşan səndin baxam çak,
Eyb olmaz çün kim, əlimdən getdi dövlət daməni.

Mehrin, ey məh, eyləməz ta mehriban könlümğə seyr,
Edəməz hərçənd kərəm olsa quyaş bəzm ahəni.

Göz üzün gördü, fəqihə eylədi tərki-səlah,
Ey gözüm mərdümləri, əhli-səlamət rəhzəmi.

Müddəilə aşiqi bixanüman sanman ki, var,
Guşeyi-qəm mənzili, künci-məlamət məskəni.

Sadiqi, Qarun vəqt urmaqda eşqilən ki, yar,
Sinəyə getməz gənci-məhəbbət məxzəni.

* * *

Şad olamazmı bilür bir qəmi-aləm nə imiş,
Mən ki, qəm həmdəmiyəm, mən bilürəm qəm nə imiş.

Mən ni qədr çü avarə olam kuyindən,
Bilür ol ləhəzatın qədri ki, həmdəm nə imiş.

Ey soran lütfilə matəmzədələr əhvalın,
Bəzmi məndin xəbər al, anla ki, matəm nə imiş.

Yürəgim qan oluban tutdu gözüm rəhgüzərin,
Şimdi bildüm səbəbi-əşki-dəmadəm nə imiş.

Sadiqi birgə xərabatnişin ortamudur,
Qəsri-qeysər nədürü səltənəti-Cəm nə imiş.

* * *

Bir nigarın hicrivü nabədin cəhanın möhnəti,
Kaş aləmdin kəsileydi könülnün ülfəti.

Sordu dün aləmni ol şux vücudun irmədüm,
Ahü əfğan kim, tilimni tutdu eşqin dəhşəti.

İl gözinə qoydu çün Şirin nişani Kuhkən,
Aqibət urdu başiğə tişə eşqin qeyrəti.

Dün təbib istürdi kim, söhbət nişani-məndə bar,
Bu sözün, ey həmnişin, əlbəttə yoxdur söhbəti.

Gərdi-xakistər bolub cismimdə, naseh, qılma mən',
Eyb imastur aşiqin bolsa bu mayelik kisvəti.

Gərçi eşqin tüstüsün Fərhadü Məcnun çaldılar,
Şimdi eşq olub olardin bizgə verdi növbəti.

Sadiqidin badə tərkin istəmə, ey əhli-zöhd,
Guiya mey birlə bolmuşdur müxəyyər tinəti.

* * *

Mənzilim dərgahi-cananımda bolğay kaş ki,
Ya ona mənzil mənim canımda bolğay kaş ki.

Bu gecə can təndə mehmandur mən ilən, ey rəfiq,
Bu gecə cananım da mehmanda bolğay kaş ki.

Çeşmə gərdə su yığub mənzil tutar, ey əksi-tən,
Mənzili bu çeşmlər yanımda bolğay kaş ki.

Ayrılıq dağı bilə yandı könüldin idi can,
Yanmaqdadır bu könül yanımda bolğay kaş ki.

Kaş bolğaydı qulağidə fəğanım birlə ah,
Ya qulağı ahü əfğanımda bolğay kaş ki.
Kərəmruluq göstərib qalmışam birun,
Bu rəviş birəhm sultanımda bolğay kaş ki.

Sadiqi, əvvəl qədəm qoyma fəqir bu viranə,
Mənzilim dərgahi-cananımda bolğay kaş ki.

* * *

Qalmağay erdi bu aləmdə məhəbbət kaş ki,
Tuşkey erdivü berdin rəsmi-müvəddət kaş ki.

Çün əlif tək vahid olmaqdur cəhandin aqibət,
Tutmağay erdi kişi hiç kimlə ülfət kaş ki.

Bilməs ermişlər kişi qədrin vətən əbnası çün,
Tutğay erdi damənimni xaki-qürbət kaş ki.

Dersən, ey naseh ki, məndin tut nəsihət, aqil ol,
Tutğay erdi bu könül məndin nəsihət kaş ki.

Sihhətim verdi iyadətdin peşimanlıq sana,
Bermegey erdi mana əyyam sihhət kaş ki.

Öldürür, ey Sadiqi, ol ay bu gün-danla səni,
Bergey erdi bir-iki gün çərx möhlət kaş ki.

* * *

Çadruyə yüzni, ey şux, diraz qılma məni,
Dağıtma kakilinə, biqərar qılma məni.

Rəqib bəzmi əz şürbi-mey hərarətdin,
Ərəq töküb yüzdin əşkbar qılma məni.

Bu gün nihan səri-kuyinə gəlmişəm, ey dil,
Nihani ah çəkib aşkar qılma məni.
Bəraət hesabdə tut bu əsbabından,
Qəribü bikəsü bietibar qılma məni.

Cəmali heyrəti bihuşim söləşmə, rəqib,
Sadiqi-sadiq səva durub hüşyar qılma məni.

Qədəm qoyub ura gözüm laf urdu mərdüm,
Qıl imdi rəncə qədəm, şərmsar qılma məni.

Gülüm, çavurma yüzün qeyrə, Sadiqi yanlığ,
Bu gülşənində rəşki-məzar qılma məni.

* * *

Etmə vaqif öldügümdin növhəgər həmdəmləri,
Qorxaram tutqay məlalət xatiri-xürrəmləri.

Et sən, ey əhli-cəhan bəzmi-cəhandə şadlıq
Kim, özüm birlə apardum cəhandin qəmləri.

Qeyrə məhrəm xublər bəzmində naməhrəmdür,
Bu sözə şahid bu kim, məhrəmdür məhrəmləri.

Könlüm almaqdı, nə bim, etkay gözün mərdümləri,
Yoxdur yüz min dilavərdin cuyayguləri.

Növhə qurmazlar cəhan dövründə matəmdidələr,
Sadiqi, sən olmasan sərhəlqeyi-matəmləri.

* * *

Rəhm edib atmaz oxun yar ürəgim yarəsinə,
Bumudur xubların çarəsi biçarəsinə.

Tüşdilər bir-birinə didəvi dil ləlin üçün.
Qan olur, girmək olurmu buların arəsinə.
Yandı bağrım, könül ayinəsini tutdu qübar,
Düşəli xalü xəti arizü rüxsarəsinə.

Girdbad eylədi dəvi məni-sərgəştə ilən,
Yetiməz hər kişi dəşti-qəmin avarəsinə.

Dedilər sərvi-qədi cilvəgər oldu yarın,
Getdimi göz seyli sirişkim bilə nəzzarəsinə.

Tökülən damənimə qətreyi-əşkim gecələr,
Fələkün tənə edər sabitü səyyarəsinə.

Sadiqi, gər yürəgün qanın içər, ah etmə,
Könlüni vermiş idün qəmzeyi-xunxarəsinə.

* * *

Göz yaşım verme qəmi-ahi-səhərgahlərə,
Yanar əflak könüldən çəkilən ahlərə.

Qoyma xali gözümi şəm'i-rüxün əksindən,
Qoysalar eyb degil şəm nəzərgahlərə.

Qeyr tutdu ətəgin saidini öpmək üçün,
Dövlət əl verməsə yeg  himməti kütahlərə.

Dərdi-dil xublərə hacəti-izhar degil,
Ərzi-hal eyləmə sən səngi-dil agahlərə.

Sadiqi, söyləmə zöhhadə qədəh keyfini sən,
Rəhi-meyxanəni göstərmə bu gümrahlərə.

* * *

Hüsnün ki, canibi-xəti ənbərfəşan tutar,
Axır cəhanı fitneyi-axırzəman tutar.
Əglənmədi könüldə dəmi qanıma degil,
Bişək bəla imiş bu ki, qanlını qan tutar.

Var əqrəb rəqəmi nurluğun müşahibəti,
Ya Rəb, nədən bu iti münhəmi yəman tutar.

Məcnunə nisbət eyləmə kim, məni-rəmidəni,
Derlər ki, qövs batanda əbnin dastan tutar.

Ar etmə itlərinlə fəğan etsə Sadiqi,
Ari degil bu işdə üzün həmzəban tutar.

* * *

Navəki-cövrün sinəmə könlüm ona peyvənd eylənüz,
Bu səmərdin nəxli-ömrümni bərumənd bar eylənüz.

Ey edənlər mehr ilə xoşdil qərəz ərbabını,
Gah-gahi bəzmi həm cövrilə xürsənd eylənüz.

Ya çəkin divanə könlümni vəfa zəncirinə,
Ya çəkib tiği-cəfa pərkənd-pərkənd eylənüz.

Ağrı rüxsarındamıdur xəstə könlüm dərdnak,
Ey dəvacular, tədava çün gülbənd eylənüz.

Bidi-məqtuli imastur tilbə nasehlər məni,
Əql təklifidin ol qabili-bənd eylənüz.

Sadiqitin qeyri-rusva sanmanız, ey əhli-həvəs,
Əql ərbabın səri-Məcnunğə manənd eylənüz.

* * *

Ey əcəl, al canımı, aləmni ansız körməyin,
Canımı canansızü cismimni cansız körməyin.
Cilvə qılmas qaməti könlüm ara kur et közüm,
İstərəm bu bağnı sərvi-rəvansız körməyin.

Qoy yıxılsın səbr bünyadı, tökülsün cami-eyş,
Közümi seylabsız, bağrımı qansız körməyin.

Keçdi ömrüm yarsız, ey çərxi-dun, tap al canım
Kim, həyat əyyamını ol novcəvansız körməyin.

Gər xəyalı gəlməsə gözdin qılay qət'i-nəzər,

Sadiqi, hərgiz bu evni mehmansız körməyin.

* * *

Xoşa onlar ki, canan bəzmində məhrəmləri bardur,
Mənimdik bikəs ərbablar, yavuq həmdəmləri bardur.

……… çün söz birlə əhvalın sorar əğyari-bidərd,
Neçün şad olmasunlar, rəhmsiz mərhəmləri bardur.

Məgər kim, ol səri-ku itləri məlum qılmışlar,
Mənim yox olduğum kim, əcəb matəmləri bardur.

Məni əfsürdə qıldı hicr suzi-vəsli-canımdin,
Qavansunlar olar kim, özgəcə aləmləri bardur.

Gözün mərdümləri ta tutdu mənzil bəhri-əşkimdə,
Müəyyən oldu kim, aləmdə su adamları bardur.

Olar kim, şadmanluq birlə ömrü sərf qılğaylar,
Əgər naşad olursa Sadiqi, biqəmləri bardur.

* * *

Şöleyi-qəmdin mənivü səbrimi örtədi ot,
Yoxu barım örtədi səndin yıraq təprədi ot.
Gözü könlüm vəh neçün boldu xəyalın məskəni,
Kim erür bu mənzilin səqfi, suyü bünyadı ot.

Keldi gülgun sigritüp bir şuxü mən boldum əsir,
Barça el salim məni-bədruzğə uçradı ot.

Qop yanımdın həmnişin kim, şöləligdür ahi-gərm,
Qıl həzər Tanrı üçün, bilmas bilişni, yadı ot.

Sanma bitəsir ahım uçqunun, ey müddəi,
Bolma qafil kim, irür əlbəttə ot övladı ot.

Rəhm qıl həmdəmlərə, ey Sadiqi, köp çəkmə ah,
Köyməsün Məcnünivü yandırmasun Fərhadı ot.

* * *

Öylə sərkeşlik edir sərvi-qədi-rənası
Ki, yetişməz bəni-üftadəyə istiğnası.

Əl uzatmaq üçün sağərə yetməz mey ola,
Saqinin guşeyi-çeşmilə bizə iması.

Bir kərəz xatiri-pürçininə yol tapmiyəli,
Səri-kuyindəki matəmzədələr qovğası.

Meyli kəcrulərəvü lütfi dürülər caridir,
Xubluq rövzəsinin sərvi-güli-rənası.

Bəsi bənzər qədinə sərvi-səhinin, ya Rəb,
Bicəhət durmağ ilə bunca nədir dəvası?

Üstüxani-tənimi eşq hüması götürür,
Yerdə qalmaz kişinin yaxşı isə kalası.

Olmasaydı itigi həlqə bequş olmaz idi,
Sadiqi, mehrü vəfa təkyəsinin babası.

* * *

Püstə nə deyər, bəhsini eylər o dəhanın,
Ağzına bax ol ağzı açuq hiç mədanun.

Bir kərrə turub qibleyi-rüxsarinə qarşu,

Həsrətdən açıq qaldı gözü qiblənümanın.

Gördü məni, ağlar üzümə gül kimi güldü,
Seylabi-məhəbbət evini yıxdı cəhanın.

Hər didə gəlüb getməsi canə qatı xoşdur,
Ol qönçədəhəndin xəbəri varmı səbanın?

Yüz dövrə əgər eyləyə Yusif, sənə yetməz,
Məqdurmidir yetməsi xurşidə məhanın.

Ayru tüşəli dərdü qəmü möhnətə düşdüm,
Hicran səbəbi oldu bu yüz türlü bəlanın.

Qurtulmadı vəsl ilə dəxi Sadiqi qəmdən,
Şimdən bəri yox çarəsi bu dərdə dəvanın.

* * *

Sərv qaldı cilvədən sərvi-xuramanım görüb,
Gülməz oldu gül daxi gülbərgi-xəndanım görüb.

Gər pərişanəm, vəli şadəm ki, eşqidən rəqib,
Xatirin cəm eylədi hali-pərişanım görüb.

Yardən də'vayi-qətlim eyləsəm irməs əcəb,
Gər pərişan ola şux hali-peşimanım görüb.

Mahi-no ovci-fələkdə sanma gər kim aftab,
Tutdu üz şərməndəlikdən mahi-tabanım görüb.

Oldu təsiri-cünunim öylə kim, rahi –ədəm,
Tutdu Məcnuni-dəhrdən hali-giryanım görüb.
Sinəmi şak eylədüm hər yan məni bidərdlər,
Etdilər rüsvayi-aləm daği-pünhanım görüb.

Yar cövrü bəs degilmi, Sadiqi, şad olma kim,
Tərki-cövr etdi fələk birəhm cananım görüb.

* * *

Könlün istəsə qəm  dərdiğə  dəva, qədəh iç,
Özüni etmə qəmü  dərdə mübtəla, qədəh iç.

Vüsal bəzmida əgər tüşsə ərzi-halə məcal,
Hicab dəf'i üçün əl tola-tola qədəh iç.

Gör, ey disan fələkün sübhü şamı yeksan,
Əgər səbah qədəh tutü gər məsa qədəh iç.

Əgər ki, meykədəğə tüşə, möhtəsib, güzərin,
Xilafi-məşrəb edüb qılma macəra, qədəh iç.

Demə xumari bəladür deyü qədəh içmən,
Ki, bar duayi-qədəh dafeyi-bəla, qədəh iç.

Qanadı ensə  məqamın bəqa əcəl, ey dil,
Unutma dövri-qədəhnivü cabəca qədəh iç.

Zəman küdurətidin, Sadiqi, əgər bilsən,
Mükəddər olmaya könlün, mükərrəra qədəh iç.

* * *

İstərəm həmdəm olum bir neçə Məcnunlar ilə,
Yəni aşiqlər ilə, didəsi pürxunlar ilə.

Nəmi-əşkim əsəri yıxdı gözüm bünyadın,
Yıxmaq olmaz bu məmurəni Ceyhunlar ilə.

Könlə zikri-ləbin eyləmədi zülfini ram,
Nə talandur ki, tutulmaz belə əfsunlar ilə.

Nola gər olsa sarı çöhrəsi ərbabi-qəmin,
Yüzümüz olsa dilər arizi gülgunlar ilə.

Şadlıq qandavü mən qanda, budur məqsudum.
Ki, tutum guşeyi-qəm xatiri məhzunlar ilə.

Yüz çavurdi sənəmim şimdi olalı ki, kərəm,
Bəxti-bərgəştələrü taleyi varunlar ilə.

Sadiqi, gər sözünə yar qulağdur, nə əcəb,
Yandaşur gövhəri-nəzmin dürri-məknunlar ilə.

* * *

Könlümün hər dəm girər ol mahsima qoynuna,
Yeridür gər girsə Xurşidnin Məsiha qoynuna.

Sinəmi hal eyləyub ol ay xəyalın bəklərin,
Öylə kim, bəkləşdürür xaçını tərsa qoynuna.

Bağa girsəm bu sarıq rüxsarü gülgun əşk ilə,
Qönçənin istər girə gülbərgi-rəna qoynuna.

Gövhəri-əşkim cəhanı tutdu, övladur bu kim,
Qoymaya şimdən geri lölöni dərya qoynuna.

Qeyr əgər əhbab ilə bəzmi-vüsala yol tapar,
Sadiqi alır xəyali-yarı tənha qoynuna.

* * *

Məni  dün seyri-əyağ mey birlə saqi dəstgir etdi,
Famxanəsində bir idüm rövşənzəmir etdi.
Məgər kim, mai-meydən özgə bir şərbət bulunmazdı,
O gün kim, çərxi-varun xilqətim xakin xəmir etdi.

Yatıb tutmaqda fərqi yox gədanın şahdən, dövran,
Əgər yalın ona qaqım buna bəstər həsir etdi.

Behəmdüllah, bu gün bir növcəvan, saqi, əlim tutdu,
Məni-üftadəni ənduhi-dövran gərçi pir etdi.

Sənin dür tək sözünə, Sadiqi, canan qulaq tutmaz,
Səni tutdum ki, dövran ənvəri qıldı zəhir etdi.

* * *

Vüsali müjdəsidin əşkbar gözüm,
Gər ağlamas nə əcəb edir nisar gözüm.

Gözüm bəyazında xalın xəyalı bağladı nəqş,
Qırağını sanma kim, eylədür aşkar gözüm.

Könüldə qalmasa bir qətrə qan əmanətdür bana
Ki, hər barda tökər qətrə səd hezar gözüm.

Fəraq yanımda ki, ağlar oldu səbəbi,
Satur qara günə bu tirə ruzigar gözüm.

Ni tan yarutsa gözüm xəlvətini sübhi-vusal,
Fərağı-şamdə köp çəkdi intizar gözüm.

Fəzayi-kuyinə qoy seyri-əzmi birlə qədəm
Ki, zahir eylədi hər yanda taləzar gözüm.

Qərib aləm imiş eşq, Sadiqi, kim irür,
Xəzani çöhrə bilə əbri-novbahar gözüm.

* * *

Şövqim gətürdi cilvəyə ol sərvqaməti,
Münkir imiş, ey həkim, gör imdi qiyaməti.

Axır fəqih badə ayağına qoydu baş,
Anı qutardı piri-Mutğanın kəraməti.

Əğyarı gör nedüm ki, dil azurdə olmayım,
Ol ta qəbulun olmadin, olmaz şaməti.

Halım yetişdi bir yerə kim, çərx rəhm edüb,
Etdi hisar cövrümə səngi-məlaməti.

Ey Sadiqi, quvanma vüsalinə dilbərin,
Künci-fəraqı bəklə ki, yoxdur nədaməti.

* * *

Qıldı həngami-səfər sərvi-xuramanım vida,
Vəqtidür qılsa təni-dilxəstəni canım vida.

Vəsl xanı üzrə çün küfrani-nemət qılmadım,
Bəs nədin, ya Rəb, bu yanlığ qıldı imanım vida.

Barsa hər yanğə barur ardınca əşki-həsrətim,
Eyləməz ol xaki-padən çeşmi-giryanım vida.

Yardən şimdi vida əyyamidür, dustlar,
Eylənən heyrət qılursa əqlü samanım vida.

Üzri-təqsirat ilə güngü lal olsam, ni bang,
Kim, bu yanıklığ eyladi şuxi-suxəndanım vida.

Canü tən mabeynda samani-ülfət qalmadı
Kim, qılır yüz növ külfət birlə cananım vida.

Sadiqi bülbül kibi yığlab tilar avarəliğ
Kim, bu gülşəndin qılur gülbərgi-xəndanım vida.

* * *

Qəmi-fəraqın ilə dərdnak olub gedərin,
Nə dərdnak ki, qəmdin həlak olub gedərin.

Gedərlərsə cünun əhli-çakpriahən,
Yəbanə söyləmə, min sinəçak olur gedərin.

Yakarsa hicr odu aludə cismimi, nə ziyan
Ki, vəsl uçmağına safü pak olub gedərin.

Rəqib tə'ni gidərməz məni, məazüllah,
Demə bu mərəkədən zəxmnak olub gedərin.

Qapında böylə ki, qəm payimaliyəm, bilürin
Ki, aqibət rəhi-şövqində xak olub gedərin.

Vida vəqtidür, ey müddəi, cününimi gör,
Saqın, saqın, yenə bitərsü bak olub gedərin.

Nə dövri-xasdur, ey Sadiqi, bu kim, məni-məst,
Gəlüb təmani-hünər, eybnak olub gedərin.

* * *

Əgər dünya budur, bixanü biman olmamız yegdür,
Buraqıb işrət əsbabını üryan olmamız yegdür.

Bu isə şeyxü vaiz, məscidü minbər tamaşası,
Xərabat əhlidin məstü qəzəlxan olmamız yegdür.

Bularsa ol cəmaət kim, urarlar lafi-bəxşayiş,
Yetər cəm'iyyəti-xatirpərişan olmamız yegdür.

Əgər dövlət budur kim, dundən, xəlqi itaətdən,
Gəl, ey həmdəm, əlaxan olmamız yegdür.

Bulay kim, əl verə bir sərvi-xoşrəftar pabusu,
Cəhanda sayədən xak ilə yeksan olmamız yegdür.
Nədir keyfiyyəti zöhdü ribavü şəttü damanın,
Gigib divanəvəş məstü qəzəlxan olmamız yegdür.

Gəhan gülzarının xəndan gülü bərbad olur axır,
Buludtik gah xəndan, gah giryan olmamız yegdür.

Bulunmaz çün cəhan məmurəsində xaneyi-munis,
Ənisi-qəm, müqimi-gənci-viran olmamız yegdür.

Dədü damın hərifi olmanız, muri-zəifləriz,
Demə, ey Sadiqi, mülkə Süleyman olmamız yegdür.

* * *

Doldu gözüm qubari-səri-kuyi-yardən,
Gör, gör nələr yetişdi bana ruzigardən.

Eşq atəşinə yanma, yakılma demək nədür,
Od macərasın istəmədi kimsə xardən.

Canandan ayrı təneyi-düşmən nədür bana,
Yox ictinabı kalbüdün səngsardən.

Tüşdüm mühiti-eşqəvü qurtarmağa bəni,
Mövci-bəla arayə çəkər bir kənardən.

Əğyarı mötəbər eləmək güc gəlür, nolur,
Gər tüşsə Sadiqi nəzəri-etibardən.

* * *

Əlkidə al alma, imas kim, ata tutar,
Al ilə aldı könlümi ol şuxi-gül'uzar.

Cami-nişat tutsa bir o şah bəzmidə,
Tan yok əgər ki, qəm sipəhin qılsa tarü mar.
Yüz min nişat birlə quvan, ey könül, sana,
Həm yardür müyəssərü həm busü həm kənar.

Ol tərki-məst eylədikdin öpər qədəhi-şərab,
Tüşsə əlinə, can əvəzin verməgə nə bar.

Səngi-həvadisi-qəm ilə yıkılır könül,
Saqi şərabi-sağəridin qılmasa hisar.

Abbas şah bəzmidə yeksan içər qədəh,
Çingiz birlə Sadiqi rindi-meykusar.

Bolsun bu şahi-cahangirə dəmbədəm,
Dövlət mütivü bəxt rəfiqü zəmanə yar.

* * *

## SAQİNAMƏ VƏ BƏRXİ ƏZ ŞİKAYƏTİ-RUZİGAR GUYƏD

Gil, gil, ey rahəti-canım, saqi,
Başda, gözündə rəvanım, saqi.

Gil, gil, ey həmdəmi-razım, gil,
Vey qəm əyyamidə dəmsazım, gil.

Gil, gil, ey dilbəri-şirin hərəkat,
Vey zülali-kərəmin abi-həyat.

Gil, gil, ey qəmzədələr həmnəfəsi,
Beli məzləm əlinin dadrəsi.

Badəsiz bəzmi xumar öltürdi,
İntizari-rüxi-yar öltürdi.

Bir qədəh birlə xərab eylə məni,
Qərqeyi-aləmi-ab eylə məni.

Məni bir cam ilə yad eylə bu gün,
Dili-naşadimi şad eylə bu gün.

Gətür, ol mayeyi-yəxnini gətür,
Gətür, ol çeşmi-cəhanbini gətür.

Badə ver kim, qəmü dərd oldu füzun,
Necə tutsun əlimi sağəri-xun.

Getdilər həmdəmü həmrazlarım,
Dərdü qəm bəzmida dəmsazlarım.

Qanı onlar ki, məlal əyyamı,
Tutar irdüq böylə işrət camı.

Qanı onlar ki, xəvasım idilər,
Xəlvəti-xasdə xasım idilər.

Qanı ol nəxl ki, kam irdi bizi,
Vəsl canan idi növrəsimizi.

Qanı ol piri-rəhi-irşadım
Ki, hər işdə bar idi ustadım.

Qanı onlar ki, məlalət çağı,
Eşqdən özgə çe halət çağı.

Görsalar irdi ki, pamali-qəməm,
Həmdəmi-naləvü yari-ələməm.

Yarlığ birlə tutarlardı əlim,
Durub istərlər idi dərdi-dilim.

Tiri olduqca dilara idilər,
Öldügüm dəmdə Məsiha idilər.
Qanı ol əhli-vəfalar, qanı?
Mə'dəni-cudü səxalar qanı?

Tut qədəh kim, ələm öltürdi məni,
Tiri-barani-qəm öltürdi məni.

Qədəhi tut ki, bula dafeyi-huş,
Anı içkəndə deyə nuş süruş.

Qədəhi tut ki, anı malamal,
Zal əgər içsə, bula Rüstəmi-Zal.

Qədəhi tut ki, içib məst olayım,
Badəkeşlər bilə həmdəst olayım.

Bir tolu rəhm elə vapəsliğimə,
Yox ki, vapəsliğə, bikəsliğimə.

Bergil ol cam ki, cəm mayəsidür,
Can təmənnası, könül vayəsidür.

Fürsəti bar bu gün, badəni sun,
Olmasun dəhrimin olmasidin son.

Yox ikən bir yeməgə dəstrəsim,
Səbədün badeyi-cami-həvəsim.

Şimdi kim, saldı ayağdin məni çərx,
Bolmasun heç kişinün düşməni çərx.

Nə təhəmmül, nə təğafüldür bu,
Bir qədəh ver, nə təkahüldür bu.

Yarlar yarlığı böyləmi olur?
Yar qəmxarlığı böyləmi olur?

Bumudur əhli-mürüvvət rəvişi?
Bumudur yari-kərəmpişə işi?

Yarlığ şəm'i söndümü, nədür?
Yoxsa qanlar suya döndümü, nədür?

Gör ki, çərxi-sitəmayin netdi,
Bu qələt gərdişi-kəmbin netdi.

Mən ki, ərbabi-vəfa irdi işim,
Bivəfalarğa idi sərzənişim.

Şimdi dövrani-cəfapişə məni.

Gərdişi-çərxi-kəcəndişə məni.

Bivəfalar bənə zari etdi,
Aqibət payi-çinari etdi.

Dəhrdə qalmadı bir mərdanə,
Hərfi-sövtilə keçər əfsanə.

Oldu əsbabi-şücaət pamal,
Öltürür Rüstəmi-Zal örtiğə zal.

Saqiya, gəl ki, pərişan oldum,
Köp əlaxanü əlaman oldum.

Sadiqi, pəs neçə bir şərhi-məlal,
İşrət ərbabına barlandı kəlal.

Sana kim, dövri-qəm üftadəsisin,
Yox ki, azadələr azadəsisin.

Saqinin lütfü ətası bəstür,
Meykədə abü həvası bəstür.

* * *

**ƏRZİ-HAL**[1]

Ey sipehri-bərinə mehri-münir,
Şahi-aləmstani-kişvərgir.

Dedi gərdun fələk sərir sana,
Əbdkum yazdı çərxi-pir sana.

---

[1] Бу башлыг шеиря шярти олараг верилмишдир.

Təxt iyiligi rikabgirindür,
Cami-giytinüma zəmirindür.

Sən bu gün padşahi-İransan,
Cami-Cəm aləmə Süleymansan.

Padşahım, sipehri-hiylənüma,
Gör nə rəng ilə cövr qıldı bana.

Şah Təbrizə əzm qılğanda,
Əzm ilqarı cəzm qılğanda.

Bəxt sahibi-fəraş qıldı məni,
Mərəzə xacə taş qıldı məni.

Eylədi dur xaki-rahindən,
Saldı iraq məni sipahindən.

Şimdi üç ildən füzundur məni-zar
Ki, gəhi sağəm və gahi bimar.

Eylədüm xidmətində çox təqsir,
Leyk şahənşəhi-sipehrsərir

Qalmadı etdüğim günahlərə,
Qatmadı məni üzrxahlərə.
Yenə yüz lütfü yüz kərəm qıldı,
Sərfəraz etdi, möhtərəm qıldı.

Bu uçurda ki, bəxt yar oldu,
Söhbətim təndə bərqərar oldu.

İstədüm xaki-rəhgüzarın olum,
Canfəşanlığda biqərarın olum.

Şükrüllah, yetişdim ol kamə,
Yetdi ağazi-əzmim əncamə.

Ayağın toprağına yetdi yüzüm,
Bəlkə səm'i-qəbula yetdi sözüm.

Çərx gördü ki, şahi-bəndənəvaz,
Mana qanun lütfün eylədi saz.

Əndəlibmədih oldu tilim,
Daməni-iltifatə yetdi əlim.

Təb'imə əş'ar yol tapdı,
Eyş viranə könlümi yapdı.

Yenə bir rəng etdi çərxi-dürəng
Ki, səməndi-səadət oldu ləng.

Yəni aldı ayağımı əyyam,
Sındı əlkimdə incidin tolu cam.

Bir mərəz birlə bağladı ayağım
Ki, səri-kuyin olmaya tayağım.

Tüşdü yoldan səməndrəftarım,
Gögə yetişdi naleyi-zarım.

Tapdı çün payi-illətim payə,
Ərz qıldım anı ətibbayə.

Etdilər çün dəva büsatını teyy,
Dedilər axır üd-dəvar əlini.

Min heyvanə təb'i-baytarı,
Bir tükün qoydu karü barı.

Mərəzə dağ vermədi səhhət,
Bu həm oldu izafeyi-illət.

Olmadı dağ dərdimə mərhəm,
Bir ikən iki oldu dərdü ələm.

Səndin, ey padşahi-qədrbülənd,
Olmuşam bir dəvayə hacətmənd.

İstərəm hacətim rəva edəsən,
Rüsxətilə mana dəva edəsən.

Şahi-Cəmcah gilməsinə rəvan,
Olum mən iraqə müjdərəsan.

Nameyi-fəthini əyan edim,
Xas ilə amı şadman edim.

Ta dəva dərdi-canə mərhəmdür,
Ta ələm mənşeyi-qəmü həmdür.

Dustun bolmasun aləmdə əsir,
Düşmənin olmasun bəladən sir.

* * *

## TƏRKİBBƏND

Mənəm ki, sakini-meyxaneyi-diyari qəməm,
Hərifi-badəkeşi-bəzmi-sağəri-ələməm.

Əlimdə cami-bəla, eşq kişvərində Cəməm,
Nəzərdə gərçi gədayəm və leyk möhtəşəməm.

Başımda çətri-siyəh sayəbani-ahımdur,
Hücumi-dərdü bəla ləşkərü sipahımdur,

Mənim ki, gəzmədi hərgiz sipehr kamımla,
Müyəssər olmadı bir kam ehtimamımla,
Oturmadım nəfsi sərvi-xoşxuramımla,
Tamam olmadı ömrüm məhi-təmamımla.

Həmişə çərxdən azardur nəsib mana
Zəmanədən yetişür möhnəti-qərib mana.

Nədür zəmanə işi, cövr ilə cəfa etmək,
Sipehr şivəsi təğyiri-müddəa etmək,
Rəqib dərdi-dilin bilməyüb dəva etmək,
Məni ki, dərdi-dilim sərbəsər cəza etmək.

Könül, zəmanədən incinmə, şadü xursənd ol,
O aqil irməz isə, bari sən xirədmənd ol.

Hilal tək fələkün cövründən xəm olsan tək,
Bəlayə həmnəfəsü dərdə həmdəm olsan tək.
Hərimi-cövrü cəfa məhrəmi-qəm olsan tək,
Qəribü badiyəpeymayi-aləm olsan tək.

Ki, əglənüb qalasan qeyr müddəasilən,
Bəli, deyib gəzəsən özgələr rizasilən.

Əgər ki, yarə müti olsa yar, ar olmaz,
Qəbuli-xidməti-əhbaba şərmsar olmaz,
Rəfiq xidmətidi, kəsri-etibar olmaz,
Get-gedə sitəmin çəksə, xarü zar olmaz.

Nəuzbillah, əgər süflə ola mənzurün,
Günah ilə nə miqdar ola məqdurün.

Şükür kim, talibi-dünyayi-dun degil könlüm.
Hərifi-xəlvəti-bəzmi-cünun degil könlüm.
Müqəyyədi-qədəhi-laləgun degil könlüm,
Zəbuni-minnəti-xəsmi-zəbun degil könlüm.

İşim həmişə qəmü dərd birlə şad olmaq,
Murad tərkin edüb rindü namurad olmaq.

Nə bir rəfiq ki, rəf'i-məlal edəm naçar,
Nə bir təbib ki, dərdi-dil eyləyim izhar,
Mənəm həmin qəmü ənduhü kəsri-səbrü qərar,
Budur mana fələkün lütfü az-çox dəvvar.

Nə ruzigar, nə dirilik, nə müddəadur bu,
Bu işdə kari-rəva olmadum, rəvadur bu.

* * *

## QİTƏ

Ey qorçubaşı, ey sitəm əhlinə pişva,
Şahın qulu olan sözinə bipir gərək.

Fərmani-şahdur, versən alduğun geri,
Fərmanə baxmadun, sənə mövtdən həzər gərək.

Hökmə qulaq asmadınü baxmadun daği,
Ərbab zülmü cövrini kurü kər gərək.

Mən şamlu fəqiriyəm, sən qəcər bəgi,
Sən əhli-şərsənü sana bir əhli-şər gərək.

Abbas şah hökminə endürmədün boyun,
Boynu yoğunlusan, sana tiğü təbər gərək.

Şahdan səninçün alayım bir qəcər dağı,
Bildüm yəqin ki, kuni-xərə kiri-xər gərək.

* * *

## M Ü N D Ə R İ C A T